ملا نصر الدین

№6. Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپیك ٦



Biya,biya, meymun biya

Литог С. Быкова




Dövlətli müsəlman bəyinin kabineti

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д.24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**
**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**29 məhərrəm 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 18 fevral 1909**



## *KÜFLƏ QURDU*

"Tərəqqi"nin 22-ci nömrəsini oxuyanlar ilə bir az söhbət edək.

Bəli, Aşqabadda mərsiyəxan Hacı Molla Əbdüləli camaata söz verir ki, şami-qəriban gecəsi qabaqca Firudini və Müzəfferi məktəblərinə pul yığsın, sora özünə pul istəsin.

Çox gözəl. Axşam olur, mərsiyəxan çıxır minbərə və müsəlmanları behiştə göndərəndən sora başlıyır qabaqca özünə pul yığmağa. Müsəlmanlar da verirlər. Verhaver verhaver. Ay verən əllər hurilərin məməsini elləsin. Ay yerindən duran ayaqlar qıl körpüdən ildırım kimi keçsinlər. Ay pul verənlər birə min əvəz alsınlar!

Bu nəhvlə mərsiyəxan qabaqca min manatını yığır. Bəli, müsəlmanlar da deyirlər ki, əlbəttə, inşallah, mərsiyəxan öz pulunu yığandan sora məktəblərə də pul yığacaq.

Aha, molla pulları cibinə qoyan kimi birdən iki əli ilə qırxıq kəlləsinə döyə-döyə başlıyır:"Ay haray, bu gün şami-qəribandi, çıraqları keçirdin. Başlıyırlar çıraqları keçirtməyə. Məscid olur qaranlıq. Lotu dinməz-söyləməz, Sumbatov küçəsində gecə yarısı xəlvət gəzən iranlı məşədiləri kimi, minbərdən züvüldüyüb düşür yerə və məsciddən çıxıb gedir. Behişt əhlləri də bir az oturub əsniyirlər və durub gedib evlərində yatırlar.

Molla Əbdüləli də gedir sabahısı günü bir nəfərə, Əlibəyə deyir ki, "yaxşı minmişəm bu eşşəkləri".

Bunların hamısı millətimizin tərəqqisinə böyük dəlildir. Və bu tərəqqimizə də səbəb bir neçə vüquat olub. Əvvəla, rus-yapon davası hamı millətlərin gözünü açdı. Sora Rusiyada hürriyyət davası başlandı və bu davanın, əlbəttə, biz müsəlmanlara da az-çox tə'siri oldu. Sora da erməni-müsəlman ədavəti başlandı - dəxi orada müsəlmanların gözləri birdən açıldı. Şəhərlər və kəndlər doldu məktəb və qiraətxanalar ilə. Hər yerdə "Nəşri-maarif" əmələ gəldi. Xülasə, maşallah, müsəlmanların bir tərəfdən özlərinin çalışmaqlığı ilə, bir tərəfdən də xüdavəndi-aləmin lütfü sayəsində o qədər qabağa gəldilər ki, Ordubadda mərsiyəxanlar başladılar allahın evində küçə fohşləri danışmağa. Şamaxıda mirmehdilər, həmçinin Gəncədə yuristlərimiz başladılar mərsiyəxanlara mürid olmağa və mərsiyəxanlar da müsəlmanların belinə palan qoyub minəndən sora öz dilləri ilə dedilər ki," bax, gör bu eşşəkləri necə minmişəm!.."

Təəccüb ki bu gördüyümüz fokusların hamısı məhərrəmlik







əyyamında baş verir. Bundanmı ibarətdir imama tə'ziyə saxlamaq? Rəvadırmı ki, matəm günləri hər bir mütrüb babası, fahişəxana lotusu, Gilan qaraçısı, "Ədil ağa" zəlisi, Ərdəbil pişiyi, Allahverdi küflə qurdu - adını rozəxan qoyub çıxsın minbərin üstünə və biçarə müsəlmanları allahın evindən irgəndirsin?

Nə vaxt bunun axırı olacaq?..

**Molla Nəsrəddin**

## BİSAVAD

"Bisavad" bə'zi vaxt pis sözdü, bə'zi vaxt yaxşı sözdü. Elə adam var ki, ona "bisavad" desən - inciyər. Elə adam var ki, sən deməsən də, özü döşünə döyə-döyə deyər: "Mən bisavadam".

Adamına baxar və yerinə baxar.

Bu günlərdə Tiflis cəmiyyəti - xeyriyyəsinin iclasında katibdən söz düşdü. Yə'ni bir elə cavan axtardılar ki, həmi rusca oxumuş olsun, həmi də müsəlmanca savadlı olsun ki, cəmiyyətin dəftərlərini yazsın və qeyr yazı-pozusunu əmələ gətirsin.

Hazırda olan ağaların hamısı rusca yarımçıq oxumuş və bir parası dolu oxumuş cavanlar və qeyr cavanlar idi.

- Kim katib olsun? Bəli, filan bəy katib olsun - bu sözü eşidən kimi haman bəy yerindən qalxıb təşəxxüs ilə deyir: - Ağalar, mən rusca bilirəm, amma müsəlmanca "panimat" eləmirəm, yə'ni qanmıram, yə'ni bilmirəm, məni katibliyə seçməyin.

Çox əcəb, bir surətdə ki filan bəy müsəlmanca bilmir, filan ağanı katib seçək.

Haman ağa da genə haman bəy kimi pəhlivan kimi ucadan camaata xəbər verir ki, "mən rusca yaxşı bilirəm, amma müsəlmanca "neznayu", yə'ni bilmirəm.

Bu sözləri yazmaqda mətləbim budur ki, yarımçıq və qeyr yarımçıq oxumuş cavanlarımıza desən ki, "sən rusca çox yaxşı bilmirsən" - bu cavan səninlə böyük dava başlar. Yə'ni rusca "bisavad" olmağını özü üçün böyük eyib hesab elər.

Amma haman ağalar müsəlmanca bilməməklərindən nəinki utanmırlar - bəlkə bilməməklərinə hələ fəxr eliyirlər.

Amma oxucularımızdan xahiş edirəm ki, bunun səbəbini məndən soruşmasınlar, çünki mən bilmirəm nədir bunun səbəbi.

Və bilmək də çox çətindir.

**Cırcırama**

## ŞİKAYƏT

Keçən nömrədə yazmışdıq ki, Nuxa camaatı mollaların əlindən şikayət eliyirlər ki, mollaların biri baş yarmaqlığı ortalıqdan götürüb biçarə müsəlmanları belə bir feyzdən binəsib qoyub.

Bu cür şikayət indi də Xasayurtdan bizə gəlib. Oranın da bir para "kəme'tiqad" ağsaqqalları camaatın qabağını kəsib qoymuyublar ki, baş yarsınlar və məscidi aşbazxanaya döndərsinlər və imam matəmini toy qonaqlığına oxşatsınlar.

Axırda bir nəfər allah bəndəsi Məşədi Pəncəli iranlı və bundan savayı da bir özgə məcbur olublar ki, xəlvətcə getsinlər başlarını Petrovsk şəhərində yarsınlar və elə də eliyiblər.

Hələ bu heç. Bu dinsiz-imansız ağsaqqallar bir nəfər müəllim də tapıblar ki, uşaqlara üsuli-cədidə ilə, nə bilim nə zəhrimar üsul ilə dərs versin.

Axır ki bunların bu işlərini gördükcə adamın ürəyi odlanır və dərdi təzələnir. Allah özü kömək olsun biz müsəlmanlara.

**Bir nəfər ürəyi dağlı**

## AND İÇMƏK

Bizim Vladiqafqaz mollasından hər ramazanda və məhərrəmdə bir hərəkət baş verir. Bu il məhərrəmdə genə haman molla adəti unutmuyub minbərdən və'z edən zaman bais nə oldusa molla əlin minbərə vurub and içdi ki, "bu minbər haqqı, bu məscid haqqı, bundan sonra mən bu minbərə çıxmıyacağam və sizə və'z etmiyəcəyəm" və bir neçə özgə andlar da içdi, onlar qalsın.

Sabahı günü cənab molla genə minbərə çıxıb (çünki pul növbəsinə bir gün qalmışdı) dedi: "Camaat, mən sizi özbaşına qoymaram, siz avamsınız, mən ki avam deyiləm". Genə pakizə və'z buyurdular.

İndi, Molla əmi, mən bir avam adamam, bu andın günahımı var, savabımı var bilmirəm, amma onu bilirəm ki, mən indi başa düşürəm ki, biz avamlar yalandan and içməyi haradan öyrənmişik.

**Avam**

## HƏR EVƏ BİRİ

Kars şəhərində yeddi həmşəri evi var idi.

Əvvəl bunların fikri bu idi ki, yeddi ev yığışıb bir yerdə tə'ziyə saxlasınlar. Məhərrəmə beş-altı gün qalmış İrandan bir nəfər mərsiyəxan gəldi. Həmşərilər dedilər ki, "nə eybi var, mərsiyəxan iki oldu, elə tə'ziyəni də iki yerdə tutarıq". Məhərrəmliyin birində bir mərsiyəxan da gəldi. Üçündə biri də gəldi - oldu dörd nəfər. Həmşərilər dedilər: "Dəxi nə eliyək, dörd yerdə tə'ziyə saxlarıq". Məhərrəmliyin altısında bir mərsiyəxan da gəldi, yeddisində ikisi gəldi - oldu yeddi nəfər. Deməк, hər evə bir mərsiyəxan düşdü.

Amma deyirdilər ki, hələ iki nəfər də gəlib həmşərilərin "başını qırxsın", daha axırından xəbərim olmadı.

**Sadıq**

## MƏTBUAT

Misirdə çıxan erməni qəzeti "Yeni fikir"dən:

Şimdiyə qədər osmanlı tayfalarının yekdigərindən mütəfərriq qalması məhzən "müsavat"sızlıqdan irəli gəlib, ya əfrad arasında şəxs e'tibarilə və ya tayfalar arasında irq e'tibarilə müsavatsızlığa dəlalət edəcək əhvalın cümləsi ittihadi-osmanlının qüvvətlənməsi əməlinə müxalifdir.

**MOLLA NƏSRƏDDİN**

Biz də belə bilirik və belə də olmalıdır. Amma genə sizin 14-cü nömrənizdəki yazılarınıza nə mə'na verək? Orada yazırsınız ki, "erməni millətinin qanunla (köhnə qanunlar çürümədimi?) müəssis olan imtiyazatı hürriyyət məzhəbinə və tə'lim-tərbiyəyə zaman təşkil etdiyindən, imtiyazati-məzkurənin xəlldən məsuniyyətinin iltizamı..."

A kişi, ha çığırırsınız və çığırırız ki, köhnə qanunlar bir qəpiyə dəyməz, İndi nə oldu ki, osmanlılar bu geniş məşrutə qanunlarının müqabilində köhnə qanunların xəllindən məsuniyyətini arzu edirsiniz?

**"BƏYANÜL-HƏQQ" (nömrə 423)**

"Qəzetələr Osmanlı, İran haqqında və ruslar barəsində çox şeylər yazırlar. Amma bizim öz əhvalımızdan, xüsusən milləti xoşbəxt və ya bədbəxt edən xatunlarımız barəsində bir şey yazmırlar.

Bizim Simbir quberniyasında xatun qız ol qədər nadan, tərbiyəsiz, şol qədər pozuqluq və zina ki yazmaqla qurtarmaz. Bir çox qəryələrdə qızlar bir həftə ərə (yigitə) gedib, ikinci həftə anasının evinə gəlir. Sora özgə bir ərə gedir, iddəsi tamam olsun, olmasın, molla nikah oxuyur. Çox vaxt mollalar qızları zor ilə ərə verirlər".

**MOLLA NƏSRƏDDİN**

Çox əcəb də edirlər, qız nə, razılıq nə? Qız nə, oxuyub hüququnu bilmək nə? A kişi, eşitmiyibsən atalarımız bir hədis rəvayət edirlər ki, xatunlar ev əşyası kimi kişiyə lazım olan bir şeydir. Bu halda dəxi nə haqq, nə hüquq? Bax, "Bürhani-tərəqqi"də müəllim cənab Hafiz Mustafa da elə bu mətləbi buyurur. Dəxi sözün nə?

**"BÜRHANİ-TƏRƏQQİ" (nömrə 64)**

"Qəlbində zığ və fəsad olmayan bir müslim ərkani-dindən bir rüknün dəlilini murad etdiyi zaman bir müdərris və bir imamdan sual edər, aldığı cavaba "qane" olaraq iman edərək gedər".

Cənab müəllim Hafiz Mustafa bu sözləri yazandan sora: "Qəzetə bir millətin ruhu və rəhbəridir" deyir.

**MOLLA NƏSRƏDDİN**

Ay qurban olum müəllimliyinə və rəhbərliyinə. Aman, boynuna böyük bir nüsxə as ki, kamalına göz dəyməyə.

Şəkk yox ki, İstanbulda Xacə Kor Əli, Kazanda İşməhəmməd, İranda Şeyx Fəzlullah, Şamaxıda Sarıtorpaq məhəlləsinin şeyxi Molla Əhməd də sizin kimi rəhbərlərdir.

## ÜZÜQIRXIQ

Səmərqəndə bir nəfər üzüqırxıq "kafir" gəlib, sinni 27 ya 28 olar. Bu zalım oğlu zalım üzüqırxıqlığından utanmıyıb gəlib özü də qramofon satır. Hansı ki bizim Hacı Molla Barat axund buyururlar ki, çaxır satmaq ilə qramofon satmaq bir hökmdədir. İndi bu utanmaz üzüqırxıq kafir üzüqırxıqlığından və qramofon satmağından utanmıyıb mərsiyə məclislərində kəmali-sırtıqlıq ilə uzun-uzun nitqlər də edir. Sözü də budur ki, "camaat, bizə lazımdır ittihad, insanlıq, təzə məktəb, vətən, tərbiyəti-nisvan". Dəxi nələr, nələr ki, Molla dayı, həqiqət, xəcalət çəkirəm yazmağa. Odur ki, ağalarımız Hacı Molla Barat axund ki Səmərqəndin qədim iranlılarındandır və özü də həm vaizdir, həm həkim, həm əttar, həm mərsiyəxan, həm apdik, həm imam, həm də hər zad, bir də Hacı Molla Qasım axund ki Gəncədən gəlib bizi də "Hidayət" etməyə, bu iki qurban olduqlarımın tə'riflərində bu qədər kifayət edər ki, hər birinin yarım xan arşını hənalı saqqalları və Hindistan uzun təhtül-hənəkləri və mərhum kirmanlı Mirzə Rzanın boynundakı zəncirdən uzun təsbihləri vardır. Bu iki cənab indi neçə gündür ki, başlıyıblar bu üzüqırxıq kafiri hər yerdə həm babi, həm şeyxi, həm dəhri, həm cəbri, həm də laməzhəb deyib təkfir etməyə. Belə ki bu günlərdə bir nəfər dövlətli hacının evində plovlu tə'ziyə var idi. Əlhəmdülillah ki, o sırtıq üzüqırxıq kafir özü də var idi. Ondan sora ki neçə "xoşsövt" rozəxanlar çıxıb oxudular, tainki Hacı Molla Qasım axund minbərə çıxıb buyurdular ki, mollalar 1327 ildir çalışırlar ki, "Vələzzalin"in məddin öyrətsinlər, genə "Vələzzulən" deyirsiz. Dəxi mollalar nə etsinlər, nə vaxt siz istədiniz öyrənməyə, olar öyrətmədilər? Camaat, mən sizə deyirəm guya gözüm ilə görüm ki, qiyamət qiyam edib, övrət-kişi çıplaq bir-birinə qarışıblar, onda görəcəklər ki, bir üçguşə kölgə var. Allah əmr edəcək ki, yüyürün o kölgənin tərəfinə, yügürüşəcəklər, birdən qrrr töküləcəklər cəhənnəmə. Kimlər?! Öküzü dananlar...

**İmza: Türküstan xəbərçisi**

## QƏRİBƏ XƏBƏRLƏR

Əylisin yaxınlığında Xoşkənişin kəndinin mollası dua yazmaq ilə bir ermənin inəyini sağaltdı.

.......

Aşqabaddan Şamaxıya yazıb Seyid Ruqiyyə molla bacını istəyiblər ki, getsin "Müzəffəri məktəbi"ndə bir neçə gün mərsiyə oxusun. Çünki məktəbin vəfatı münasibəti ilə iranlılar bir neçə gün tə'ziyə saxlıyacaqlar.

.......

Naxçıvanda bir il bundan qabaq açılan şipyonluq məktəbinə müəllim axtarırlar. Biz öz tərəfimizdən belə məsləhət görürük ki, yazsınlar Aşqabada və Naibi konsul bəradər Mufaxirud-dövlə Mirseyidrza xan keçəli istəsinlər.

## *"Gədə-huy!.."*

Məhərrəm gecəsində bir nəfər hümmətmənd cavan rozəxana pul verib Səttarxana dua elətdirmiş. Məşədi Mirzə Haşımov adında bir zat öz fikrincə bu növ fitnə qalxızan və şahın üzünə ağ olan bir adama dua etdirmək yaxşı deyil deyə, öz kiseyi-cavanmərdanəsindən şaha dua etdirmək üçün beş manat pul verdi. Rozəxan cənabları həmi Səttarxanın fəth və nüsrət etməsini və həmi şahın qılıncının kəskin olması sayəsində rəiyyətin başından kəm və kütah olmamasın dərgahi-ilahidən təmənna etdi. "Amin deyən dillər lal olmasın" sədası məscidi doldurmuşdu.

Bu üç şəxsdən ikisinin nə fikirdə olduğu mə'lum: əvvəlinci şəxsin tərəqqipərvər olduğu ilə ikinci şəxsin mazipərəst olduğu aşkardır. Lakin rozəxan cənablarının nə əqidə və nə məsləkdə olduğunu hər kəs bilsə, bizə yazsın.

## NAXÇIVAN

Bu axır vaxtlarda şəhərin ağsaqqal hacıları ki şəhər onlar ilə qərar tuturdu və bəlkə sütun hesab olunurdular, bir-birlərinə xəbər edib biçarə camaatı başıaçıq qoyub bir ucdan vəfat etməkdədirlər. Rəvayətlərə görə bunlar özləri bu dünyadan köçürlər; çünki şəhər ağzına kimi kafirlərlə doludur. Bunların bu tövr səfərlərinin cəhətinə şəhər bu saat lərzəyə gəlib hər yer titrəməkdədir. Camaat həyəcana düşüb çoxları ev-eşiklərini tərk edib şəhərdən çıxıb qaçmaqdadırlar. Dünən təngə və cana gəlmiş camaat üləma sinfi ilə bir yerdə şəhərin kənarında olan "Xudi-divanə" pirinə müsəllaya çıxdılar. Müsəllanın tə'sirindən bir fayda hasil olmağı mülahizə olunmur. Danışıldığına görə müsəllaya gələnlərin içində bir neçə kafirlər varmış. Sabahkı əhvalatı təfsilən yazıram.

**Müxbirimiz: Kabla Saqqal**

## ƏDƏBİYYAT

Ey füqəra, boş yerə ağlaşmayın,
Hər kəsi görçək ona
sallaşmayın,
Şeyxə, bəyə, pulluya
sarmaşmayın,
Qışdı deyib bunca qırıldaşmayın,
Qarğa kimi çox da
qağıldaşmayın,
Ay cücələr, bəsdi cırıldaşmayın.

.......

Kiş, kiş, ay andır, yeri gir,
gir hinə,
Baxma, şişərsən, hacının
ənginə,
Pul hanı, versin sizə hər
gün dənə?
Borclu deyildir ki, a heyvan,
sənə!
Bunca qabağında cıvıldaşmayın,
Ay cücələr, bəsdi cırıldaşmayın.

.......

Söyləmə acdır uşağım, arvadım,
Ağlır acından Nəcəfim,
Hürzadım,
Qış qatıdır, örtməyə yox bir
zadım,
Çarə nədir mətləbini annadım.
Səbr eləyin, şükr eləyin,
çaşmayın,
Ney kimi hər yerdə
sızıldaşmayın.

.......

Şami-səhər xan qapısın
kəsməyin,
Gəh həyəti, gəh bacanı
pusmayın,
Taleyinizdən də hələ küsməyin,
Müftə söyüd yarpağı
tək əsməyin,
Titrəməyin, bəsdi zığıldaşmayın,
Qışdı deyib bunca qırıldaşmayın.

.......

Olmayınız pullulara çox ümid,
Kibr, qüruri olarındır məzid.
Çox da nə lazım belə güftü
şənid?
Hali-şüma taqəti-səbrəm bərid,
"Keyfsiz"i ağlatdınız, ağlaşmayın,
Ney kimi hər yerdə
sızıldaşmayın,
Titrəməyin, bəsdi zığıldaşmayın.

**Keyfsiz**

## *1-ci nömrədəki tapmacanın tə'biri*

Nə lap kiçik, nə çox da
çox iridir,
Qarnı yoğun, boynu da
dam tiridir.
Ruhu ölüb, nəfsi hələ diridir,
İnsaniyyət paltarının kiridir.
Məmdəlidir, əskiklərin biridir,
Molla əmi! Gör tapdım
ya tapmadım?

**Əbunəsr Şeybani**

Müdir və baş mühərrir:
Cəlil Məmmədquluzadə.

## E'LANLAR

## ZİNGER KOMPANİYASININ

**TİKİŞ MAŞINLARI**

**KOMPANİYANIN MƏXSUSİ MAĞAZALARINDA SATILIR**

Möhlət ilə bir manatadək verilir.




Əl maşınaları 25 MANATA VƏ BUNDAN YUXARI

Mağaza nişanı.

Saxtalarından ehtiyatlı olun.

Rusiyanın hər şəhərində mağazaları var.

---

**"Şura"**

**Orenburqda on beş gündə bir çıxan ictimai, elmi, elmi siyasi məcmuədir.**

**Hər nüsxəsi 32 cəhifə və bə'zən daha da artıqdır.**

**Hamı savad əhlinin anlıyacağı ümumi, ədəbi bir dildə yazır. İslam aləmində çıxan ən birinci məcmuələrdəndir.**

**Qiyməti:**

**illik 4 manat,**

**6 aylıq 2 manat 20 qəpik,**

**3 aylıq 1 manat 20 qəpik.**

**"Şura" məcmuəsi ilə həftədə üç dəfə çıxan siyasi "Vəqt" qəzetəsinin bir yerdə abunə qiymətləri:**

**İllik: 7 manat,**

**6 aylıq 3 manat 80 qəpik,**

**3 aylıq 2 manat 80 qəpik.**

**Adres: Оренбургъ, Редакция "ШУРА".**

---

### İDARƏMIZDƏ SATILAN KITABLAR

| Kitabların adları | Yazanlar | Qiymətləri idarədən | poçta xərci ilə |
|---|---|---|---|
| Dərs kitabları: | | | |
| Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dərs kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Qiraət kitabları: | | | |
| Təsrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*-*-*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*-*-*- | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir (farsca) | Mirzə Mülkümxan | 20 qəp. | 24 qəp. |
| Məbdəüd-tərəqqi (farsca) | -*-*-*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıbzadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*-*-*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*-*-*- | 25 qəp. | 25 qəp. |
| Müəllimüs-şəriə (birinci hissə) | -*-*-*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüs-şəriə (ikinci hissə) | -*-*-*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıbzadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*-*-*- | 5 qəp. | 5 qəp. |

*Şagird dəftərləri: idarədə yüz dənəsi 2 manat 40 qəpik.*

---

## ОСПЕННЫЙ ТЕЛЯТНИКЪ
## Живописцева въ г.ОРЛЕ

*50 adama çatan mayenin şüşəsi - 25 qəpik, 25 adama - 15 qəpik, 5 adama çatan maye - 5 qəpik bir manatdan əskiyə göndərilməz. Göndərmək xərci 30 qəpik. 3 manata və artıq istəyənlərə 20 prosentə qədər tənzil verilir. Adres: Oryol, Jivopistsevin çiçək mayaxanası.*



---

*ТОРГОВЫЙ ДОМЪ*

*Бр. Едигаровы и Назаровы*

***Yedigarov və Nəzərov qardaşlarının ticarət evi. Bu ilin yanvarın birindən Tiflisdə Sivinski küçədə 8-10 nömrəli evdə və İrəvan quberniyası Naxçıvan şəhərində manufaktura (parça) mallarının anbarını bina eləyib əlverişli qiymətlərə satırıq.***

IV ГОДЪ ИЗДАНИЯ № 6 ФЕВРАЛЯ 8-ГО 1909г.

# "Молла Насреддинъ"

*КОНТОРА и РЕДАКЦИЯ журнала "Молла Насреддинъ" Тифлисъ, Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

*ЦѢНА на ГОДЪ*
*Съ доставкою..............5 руб.*
*За границу...................6 руб.*
*ЦѢНА за ОБЪЯВЛЕНIЕ*
*За место занимаемое строкою петита впереди текста ......10 коп.*
*позади " " " ......7 коп.*

"Molla Nəsrədin"in əvvəlinci və üçüncü ilinin cildlənmiş kitabları və boş cildləri satılmaqdadır. Cildlərin üstündə Mollanın şəkli və adı, məcmuənin tarixi qızıl vərəq ilə basılıbdır. Qiymətləri idarədə: əvvəlinci ili 6 manat, üçüncü ili - 6 manat yarım, boş cildi - 70 qəpik, poçta xərci ilə: əvvəlinci ili - 6 manat yarım, üçüncü ili - 7 manat, boş cildi bir manat.
İkinci ilin kitabları bu yavuq vaxtlarda hazır olacaq.




Mərsiyəxan: Allah cəmi məşrutəçilərə və qəzetəyazanlara lə"nət eləsin.
Camaat: Amin, ya rəbbül-aləmin!..

1909г. دوردجی ایل ۱۹۰۹

# ملا نصر الدین

№7. Цѣна 12 к. **МОЛЛА НАСРЕДДИНЪ** قیمتی ۱۲ قپیک ۷




Osmanlı məşrutəsi və cavan türklər

Литос. С. Быкова




Bay və fəqirdən, müsəlman və ruslardan pul cəm edib, 5 min manatca məscid ilə məktəbçün bir yurt alıb, qəbaləsini Qılmametov nam baynın isminə ya salcağ, hazırda bahası əqəllən 15 min manatca yetkaç, baynın gözü qızıb, " öz yurtum" deyib məscid ilə məktəbi pozaqlab, məktəbə kilkan balaları döğüb qovdu.

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д.24.*

Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.

Тифлисъ, "Молла Насреддинъ"
Редакция журнала "Молла Насреддинъ"

**E'lan qiyməti**
Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik,
dal səhifədə 7 qəpik.
Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.

**7 səfər 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 15 fevral 1909**



## İP

İrəvandan bir bela kağız aldıq:

Bir gün Hacı Şeyx Ələkbər ağa Hacı Molla Sadıq ağanın tə'ziyəsində moizə edirdi. Əsnayi-moizədə dedi: "Camaat, bir gün bir neçə adam gəldilər ikinci xəlifə Ömərdən sual elədilər ki, ya xəlifə, biz şiələri tanımırıq ki, tutub öldürək. Xəlifə çıxartdı bir ip verdi ki, bu sizin ölçünüz. Bu ip hər kəsin boynuna gəlsə öldürün, o şiədir!"

Əgər Hacı Şeyx Ələkbər ağa xırda mollaların biri olsaydı, biz bu sözlərə əhəmiyyət yerməz idik və bu barədə danışmaz idik. Və lakin Şeyx Ələkbər ağa İrəvanda o dərəcədə hörmət qazanıb ki, əgər yuxarıda yazılan əfsanəni demiş olsa, dəxi bundan sora İrəvan qırmızısaqqallılarının beynindən bu cür sözləri kankan qazması ilə çıxartmaq olmuyacaq.

İrəvanda haqq və sədaqət tərəfdarlarından təvəqqə edirik ki, işi diqqət ilə təhqiq eliyib bu barədə bizə əhvalatın əslini və həqiqətini yazıb bildirsinlər. Əgər bu xəbər yalan olmuş olsa, biz Şeyxdən üzr istəyib müxbirdən məcmuəmizdə şikayət yazarıq.

Əgər doğru olsa, o və'də genə bu söhbəti təzələrik.

**Molla Nəsrəddin**

## TELEQRAF XƏBƏRLƏRİ

**Peterburq** - Dumada deputatlar arasında neçə aydır ki, söyüş imtahanı vardı. Pruşkeviç qızıl medal ilə birinciliyi, Markov ikinciliyi qazandı.



**Kars** - Buranın Nəşri-maarif cəmiyyəti üç məhəldə üsuli-cədidə məktəbi açdı.



**Kazan** - Buradakı işanların qazanı partladı, içindən 10 pud hərami yağ, 3 pud riya və fitnə qanı, yüz dənə "Din və məişət"in təkfir peçatı, 15 pud üsuli-cədidə düşmənçiliyi çıxdı.



**Tehran** - Sayeyi-şahanədə, həmd olsun, məmləkətin hər tərəfində əmnü asayiş kəmalındadır.

**Şəki** - İmam Nurməhəmməd əfəndinin təşəbbüs və fədakarlığı ilə 30 şəxsdən ibarət üləma məclisi əmələ gəldi. Məclisin müzakirəsi gecə saat ikiyə qədər çəkdi. Məclisin qəsdi Şəkidəki mədrəsələrin tələbələrini bir yerə yığıb nizam və üsuli-cədidə ilə tə'lim verməkdir ki, 20 ildə bir tələbə heç olmasa, bir az yazı yazmaq öyrənsin.

**Şuşa** - Bura qazisi yuxusunda ağ bir eşşək görüb. Münəccimlər elə yorurlar ki, bu il vəqf işləri dəxi çərpəşiyə düşmüyəcək, mollalar üçün, inşaallah, xeyirli keçəcək.

**Bakı** - Adam oğurluyanların siyezdi oldu. Qərar qoyuldu ki, oğurlamaq sezonu (mövsümü) hələ bir az daha uzadılsın və oğurlanan adamdan pul az alınsın, heç olmasa, ən aşağı iyirmi min manat alınsın.

**Gəncə** - "İstiqbal" qəzeti adını dəyişdirib "Mazi" qoyub.

**Gəncə** - Bala Seyid məhərrəmdə bəzədiyi atın göz yaşlarına and içibdir ki, "Zərrabi" tamojnasından bir dənə müsəlman qəzetəsi buraxmasın. Hər kəs xəlvət keçirsə, iki yumruq, bir şillə cərimədir.

## HESAB MƏSƏLƏSİ

1. Hər il Rusiyadan Türküstana, qırğız və kazak yerlərinə bir milyon rus xaxolu hicrət etdirilir və hər il türkləri ruslaşdırmağa on milyon manat xərc edilir. Bu hesabla neçə il sora qırğız və kazak türkləri təmamən məhv olunarlar və bu uğurda neçə milyon camaat pulu xərc edilmiş olar?

2. Müsəlmanlar dövlətli olmaq, nüfuz qazanmaq, şəhər idarəsində vəkil olmaq, məktəblərdə nazir olmaq, fəqirlərin əmanət pullarını saxlamaq üçün neçə dəfə "hacı", neçə dəfə "kərbəlayı" və neçə dəfə "məşədi" olmalıdırlar?

3. Şamaxı və Quba uyezdindəki şeyxlər ildə üç arvad təzəliyirlər. Əlli il sonra o uyezdlərdə neçə min şeyx əmələ gələcək və hər şeyx camaatdan beşcə qoyun nəzir alsa, camaatın neçə min qoyunu əksiləcək?

4. Qafqazda hər ay iki yüz müsəlman təkfir olunur. Bu hesabla əlli il sonra Qafqazda neçə cüft müsəlman qalar?

5. Dövlətlilər hər ehsan plovunu yediklərində qarınlarında beş girvənkə yağ artır. On pud yağ artırmaq üçün neçə dəfə ehsan plovu yeməlidirlər?

## MƏTBUAT

**"Tərəqqi" yazır:**

Tehran - Rəşt iğtişaşı səbəbilə rus və ingilis səfirləri təkrar şaha müraciət edib islahat icrasını şiddətlə tələb etmişlər.

**Molla Nəsrəddin**

Deyirlər, tələbin şiddətindən şah az qalıb özündən getsin.

**"Tərəqqi":**

Bakıdakı "Sovet siyezda" bir az da yerlilərin fikrinə düşməlidir. Bir az da onların dərd və ehtiyaclarından müzakirə etməlidir. Bir az da onların ehtiyaclarına sərf etməlidir.

**Molla Nəsrəddin**

Şükr Allaha, yerlilərin baş yarmaqdan, şəbih gətirməkdən, qoçubazlıqdan savayı nə ehtiyacları vardır? Onları da ki kamal ilə yerlərinə gətirirlər.

**"Tərəqqi":**

Erməni kəndinin əhalisi upravaya ərizə verib xahiş edirlər ki, onlar üçün bir müalicəxana açılsın.

**Molla Nəsrəddin**

Hə, bax, bunların müqabilində əgər "Sovet siyezda" beş qat olmasa adam deyiləm. Amma insaf deyil ki, huşyarları qoyub, divanələr ilə vaxt keçirsin.

## POÇTA QUTUSU

Gəncədə "Mütəhəyyir"ə: Yazırsınız ki, necə ola bilər:

"Dua yazanlara leylü nəhar
lə'nət edəm,
O kəs ki mö'təqid olsa ona
məzəmmət edəm.
Bu məslək ilə sən insaf qıl,
a Molla əmi!
Necə olar ki, duanı özümə
sənət edəm.

**Cavabımız:**

Əzizim, eyləmə təşviş,
söyləmə ox, ox,
Duanəvis deyilsən, səninlə
karım yox.
Nahaq yerə elə bilmə ki,
Gəncədən başqa,
Bizim gözəl Şamaxıda
xəbərnigarım yox.

Şuşada "Qırxığ"a: Tanımadığımız adamın yazmağı ilə bir kəsə ömrümüzdə bir dəfə də sataşmamışıq. Bu səbəbdən kağızınız yatdı.

.......

Vladiqafqazda "Tavuq"a: Yazdığınız mətləblər köhnəliblər.

.......

Axtıda "Əbdül-mətləb" cənablarına: Kağızın məzmununu başa düşmədik.

.......

Gəncədə "Bir nəfər"ə: Nuxada dabbağxana qoçuları məktəb uşaqlarına mən ölüm deyən kimi, siz də deyirsiniz: "mən ölüm, çap elə". Mən ölümnən iş yeriməz.

.......

Aşqabadda "Yasa gedən"ə: Sizi tanımırıq.

.......

Gəncədə "Qarın"a: "Söhbət"i məsləhət bilmədik.

.......

Bakıda "Molla Curu"ya: Məhərrəmlərin hamısını sayıbsınız, amma erməni toyçuları yadınızdan çıxıb, elə bu bəsdi.

## MƏŞHUR ALİMLƏRİMİZ
### *(Şamaxıda)*

Yeddinci: Molla Məhəmmədhəsəndir. Bu cənab hər bir elmdən xəbərdardır, əl'an məhərrəmlik olduğuna görə rozəxandır və təbibdir və rəmmaldır və duayazandır. Xülasə, çox elmləri var, a'bavü əcdadından bir əhlisavad olmuyub. Ancaq anası göz şaxı bilirmiş. Bu cənab dəqiqəşünas olduğuna görə cinlər buna vergi veriblər, hər bir üluma vaqif ediblər və indi Göyçay bazarında mərsiyə oxuyur. Rəml elmini də yaxşı bilir, təbabət elmində şöhrəti-kamilə kəsb edibdir, tamam ələfiyyatın xasiyyətlərini bilir, əz on cümlə həbbilmüluk müshildir, düyyüm gərm və xoşkdir şiyafi əbyəzdir əmraziçeşm və süzənəkdə iste'mal olunur və mürşidül-ə'ləmdir, fərmayiş eliyir hər kəs ism bəduhira dər xaneyi-müsəlləs ba-tərtib bir iliyə çox əsəri var bərayi-məhəbbət və ədavət və be-cəhəti-qürtas və danəstəni-cayü xais, xülasə, qorxuram tul ola.

Səkkizinci: Seyid Əhməd oğlu Mirmürtəzadır. Bu cənablar iki qardaşdılar, böyüyü Seyid Məhəmməd və kiçiyi Mirmürtəzadır. Seyid Məhəmməd baqqaldır və kömür satandır, arabir dua da yazar, amma Mirmürtəza libas cəhətinə riyakarlardandır və həmişə nə'li-bisuraxları hiyleyi-atəşlə suzan və atəşlən abi bir yerə cəmləyir və Şeyx Məzid kəndində bayram namazı və ölü namazı da qılır.

Doqquzuncusu erməni naxırçısı erməni Sohomondur.

**"Kəlniyyət"**

(Mabə'di var)

## TİCARƏT VƏ EKONOMİ XƏBƏRLƏRİ

Samur mahalında Axəsti kəndində keçən 1908-ci ildə qızların məzənnəsi bu qərar ilə idi:

15 yaşında - iki yüz manat.
10 yaşında - beş yüz manat.
9 yaşında - min manat.
Təzə ildə məzənnə:
15 yaşında - yüz əlli manat.
10 yaşında - üç yüz manat.
9 yaşında - beş yüz manat.

Təzə ildə qiymətlərin əskilməyinə səbəb camaatın bir az kasıb düşməyidir. Əgər partiya ilə alan olsa, dəxi də ucuz almaq olar. Müsəlman kişilərindən xahiş edən olsa, təşrif gətirsinlər. Yaşları əllidən əskik olmasa da eybi yoxdur.

**İmza: Molla Ğuru**

## MÜSƏLMAN "ASTRONOMLARI"
### *(Kazandan məktub)*

A kişi, qəribə dünyada işlər var imiş, dəxi nə günlər gördük, nələr başımıza gəldi. Molla əmi, başına dönüm, axı sən dünyagörmüş qocasan, bir de görüm heç ömründə eşidibsən ya görübsən ki, allahın yekə ayını yerindən tərpədələr? Bilirsən hansı ayı deyirəm? Göydəki ayı deyirəm. Di qulaq as, mən başdan danışım. Bizim bu xaraba Kazanda çox işlər baş verir və bu bir aşkar işdir. Nə bilim, ay başına dönüm, burada bir "universitet" deyirlər, nə deyirlər, var, yığılıblar başı şapkalı ruslar ki adlarını "professor" qoyublar və başlıyıblar ki, filan belə getdi, filan belə gəldi. Hər gün görürsən ki, cavan uşaqları başlarına yığıb, onlara dərs oxuyurlar və bəyan edirlər ki, nədən İtaliyada yer tərpəndi. Bunlara deyən gərək ki, ay axmaqlar, sizə nə düşüb ki, belə işlərə məşğul olursuz? Yer tərpəndi sizə nə, tərpənmədi sizə nə?

Amma, Molla əmi, genə şükür bu kafir ruslara! Müsəlmanın alimləri və professorları ruslarınkını da yoldan çıxarmışlar.

Kazan müsəlmanlarının arasında üç zorba "astronom" əmələ gəlib. Bunların biri Kazan şəhərinin qlasnılarından Qizzətullin cənablarıdır, o biriləri də Molla Səfi və Muqminovdurlar.

Bir neçə vaxt bundan qabaq Kazan şəhərinin qlasnıları təsdiq etmişdilər ki, gərək müsəlman dükanları və mağazinləri cümə günləri və böyük müsəlman bayram günləri bağlansınlar. Amma buna qlasnı Qizzətullin razı olmamışdı, çünki bu cənabın özünün də Kazanda mağazinləri var

və buna görə istəmirdi ki, cibə zərər dəysin. Qizzətullin demişdi ki, tək cümələri bayram etmək kifayətdir. Amma onun sözünə qulaq asan olmadı. Onda qlasnı Qizzətullin acığa gəlib dedi: "Siz ki mənim təklifimi qəbul etmədiz, mən də öz bildiyimi qayıracağam".

Molla Səfini və Muqminovu çağırıb onlara buyurdu ki, bir təzə divar təqvimi yazsınlar və sə'y eləsinlər ki, cəmi müsəlman bayramlarını cüməyə salsınlar.

Bu cür bir divar təqvimi çapdan çıxıb satılmağa başladı. Amma heç o biri təqvimlərilən düz gəlmirdi. Məsələn, yanvar ayının 21-də Kazan müsəlmanlarının bayramı idi. Çünki haman günü bolğar milləti islamı qəbul edib və bu gün o biri təqvimlərilən düşürdü çaharşənbəyə. Amma Molla Səfi və Muqminov cənablarının sə'yi ilən bu günü çəkib gətirmişdilər cüməyə. Bu barədə ay çox çığır-bağır saldı ki, ay haray, ay dad, hara məni yerimdən tərpədib çəkib aparırsınız? Amma müsəlman astronomları dedilər: "Kəs səsini".

Genə şükür bu rusun kafirlərinə. Heç olmasa allahtaalanın ayına əl aparmırlar!

**Bayquş**

## MÜJDƏ

Rusiyada, hətta Sibiryada belə yer olmadığına görə malakanları Gəncə şəhərinə doldururlar. Müsəlmanlar da söz qoyublar ki, acıq ilə cəmi yerlərini malakanlara satsınlar. Doğrudan da, yer nəyə lazımdır, bəlkə birdən qaçaqaç düşdü. İnşaallah, yüz ildən sonra Gəncə Moskov kimi bir şəhər olacaqdır. Küçələrdə salam yerinə "izdrasti" eşidəcəksən. Və papaq yerinə "şapka" görəcəksən. Düşmənin gözü kor olsun.

**Qarın**

## ELMİ SÖHBƏT

**Dəli** - Axund, Nuh peyğəmbər tufan zamanında gəmisinə kimləri qəbul elədi?

**Axund** - Yalnız iman gətirənləri.

**Dəli** - Demək, asilərin hamısı həlak oldu?

**Axund** - Bəli, tək bir məxluq da qalmadı.

**Dəli** - Çox əcəb, şəkk yox ki, asilərin başçısı olan və Həzrət Adəmi aldadan şeytani-məl'un da tələf oldu.

**Axund** - Təəssüf ki, şeytani-məl'un bijliklə yaxasını qurtardı.

**Dəli** - Ay axund, qadanı alım, nə deyirsən? Allahın divanı, peyğəmbərin gəmisi Ordubad meydanı deyil ki, bijlik keçsin? Heç elə şey ola bilməz!

**Axund** - Gərək olmuyaydı, amma görünür qədər elə imiş ki, olubdur.

**Dəli** - Dərdin mənə, axund, o cür bijlikdə də qədər olarmı?

**Axund** - Olanda olar, bizim nə həddimiz, elə şeyləri axtaraq.

**Dəli** - Aman, bir de görək, şeytan nə cür bijliklə yaxasını qurtardı?

**Axund** - Şeytana bijlik əskikmi? Eşşək gəmiyə girəndə o da quyruğuna yapışıb gizlicə daxil oldu və tufandan canını qurtardı.

**Dəli** - Vay, zalım oğlu, kaş Nuh peyğəmbər görüb suya buraxaydı və canımızı o məl'undan qurtaraydı. Axund, bu gözəl elmlər hansı kitablarda yazılıb? İltifat edib öyrədiniz ki, biz də oxuyub alim olaq.

**Axund** - Köhnə kitabların, hətta bir para təfsirlərin hamısında, xüsusən gəncəli Şeyx Hacı Həsən Mollazadə cənablarının "Zübdətüt-təvarix" adındakı ibrətli tarix kitabında.

**Dəli** - Sağ ol, axund, çox başağrısı verdim, bağışla. Bircə sual da edib, bu dəfəlik sözümü qurtaracağam.

**Axund** - Borcumuz hidayətdir, nə şəkkin varsa soruş, heç sıxılma!

**Dəli** - Allah ömürlər versin! Axund, tufan yalnız Nuh qövmünümü həlak etdi, yoxsa cəmi yer üzündə məxluqatı?

**Axund** - Şəkk yox, yer üzündəki cəmi məxluqatı həlak etdi, ancaq gəmidəkilər xilas oldu.

**Dəli** - Vallah, bu dəli ağlıma bu böyük sözləri heç sığışdıra bilmirəm. Axı nədən ötrü adil olan allah bir Nuh qövmünün təqsiri üçün cəmi dünya üzündəki qövmləri və məxluqatı həlak etsin? Nuhun məmləkətindən uzaqdakı milyonlarca məxluqatın günahı nə idi?

**Axund** - Kafir olursan, allahın hikmətindən sual etmək olmaz.

**Dəli** - Dəxi məni bağışla, xudahafiz!

**Lağlağı**

## BAKIDA

Cümə günüdür, boş-bikar, allah, hara gedim, hara getmiyim?.. Başım lap şişib, yaxşısı budur genə gedim Quba meydanına. Bir-iki ağsaqqal qabaqca, mən də dalca gedirdim. Bunlar belə söhbət edirdilər: "Ay Hacı, bildir Hüseynqulu məscidində çoxluca pul yığıldı ki, məscidin həyətini böyütsünlər, yer ki almadılar, bəs pullar necə oldu?" - "A Məşədi, sənə nə? Pul idi istədilər, verdik. Nə dərdim nə oldu, nə olmadı? Belə pullar çox yığılır... İstərsən başın salamat olsun, dinmə, vəssalam!"

Bəli, çatdım Quba meydanına. Gördüm çoxluca müsəlman yığılıb, mən də getdim gördüm ki, bir dərviş əlində çoxluca qırmızı, yaşıl və göy kağızlar tutub deyir: "Hər kəs bu duadan bir dənə alıb yanında saxlasa, cəmi bəladan xilas olar, güllə batmaz, xəncər kəsməz, dünyada nə mətləbi var isə allah onu verər..."

**Dərdmənd**

Müdir və baş mühərrir:
Cəlil Məmmədquluzadə.

## E'LANLAR

Jurnalımızın təzə və köhnə nömrələri və kitabları Bakıda satılır Parapetdə, Varonsovski, Vrangelski küçələrinin küncündə Məşədi Əyyub Ələkbərovun dükanında. Xahiş edənlər oraya təşrif gətirsinlər.

Məhəmməd Hadi Əbdüssəlimzadənin 234 səhifədən mütəşəkkil "Firdovsi-ilhamat" nam məcmueyi-şe'riyyəsi mövqei-intişara qoyuldu. Qiyməti bir manat 40 qəpikdir. Arzu edənlər aşağıdakı adresə müraciət buyursunlar: Bakı, bəradərani-Orucovların mətbəəsində Məhəmməd Hadi Əbdüssəlimzadəyə.

Баку, Типографія бр. Оруджевыхъ, Мухаммедъ-Хади Абдуссалимъ-заде.

*ТОРГОВЫЙ ДОМЪ*

*Бр. Едигаровы и Назаровы*

***Yedigarov və Nəzərov qardaşlarının ticarət evi.***

***Bu ilin yanvarın birindən Tiflisdə Sivinski küçədə 8-10 nömrəli evdə və İrəvan quberniyası Naxçıvan şəhərində manufaktura (parça) malların anbarını bina eləyib əlverişli qiymətlərə satırıq.***

**1909**

sənə üçün "Bürhani-tərəqqi" ilə "Mizan" qəzetələrinə abunə dəftəri açıqdır.
"Bürhani-tərəqqi" ilə "Mizan" qəzetələrinə ikisinə birdən abunə bədəli

**Şəhərə**

Rublə Qəpik Rublə Qəpik
sənəlik 3 - altı aylıq 2 -
üç aylıq 1 25 bir aylıq - 45

**Başqa şəhərlərə**

Rublə Qəpik Rublə Qəpik
sənəlik 4 - altı aylıq 2 50
üç aylıq 1 50 bir aylıq - 60

Yalnız "Bürhani-tərəqqi", yaxud "Mizan" qəzetəsinə abunə bədəli

**Şəhərə**

Rublə Qəpik Rublə Qəpik
sənəlik 2 - altı aylıq 1 25
üç aylıq1 85 bir aylıq - 30

**Başqa şəhərlərə**

Rublə Qəpik Rublə Qəpik
sənəlik 2 50 altı aylıq 1 50
üç aylıq qəbul edilmir İstanbulda nüsxəsi 25

*Adres: Astraxan kantor, "Bürhani-tərəqqi", "Mizan".*

**Badkubədə Mehmanxaneyi - "İslamiyyə"**
**Гостиница "ИСЛАМИЯ"**
**въ гор. БАКУ.**

**Nömrələrinin qiyməti 1 manatdan beş manata qədərdir və aşpazxanamızda hər cür Asiya və Avropa xörəkləri mövcuddur. İstirahətini sevən müştərilərdən mehmanxanamızı bir dəfə gəlib görmələri rica olunur. Pasportsuz müsafirlər zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar.**
**Adresimiz: Qubernski küçədə, Lalayevin evində Mehmanxaneyi-"İslamiyyə".**
**Sahibi-mehmanxana: İsmayıl Mahmudzadə.**
**Баку, Губернская ул., номера "ИСЛАМИЯ", телефон 1251.**

**İDARƏMIZDƏ SATILAN KITABLAR**

| Kitabların adları | Yazanlar | Qiymətləri | |
|---|---|---|---|
| | | idarədən | poçta xərci ilə |
| Dərs kitabları: Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dəsr kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Bəsirətül-ətfal | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Uşaq bağçası | -*-*-*- | 25 qəp. | 30 qəp. |
| Qiraət kitabları: Təşrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*-*-*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*-*-*- | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir (farsca) | Mirzə Mülkümxan | 15 qəp. | 17 qəp. |
| Məbdəi-tərəqqi (farsca) | -*-*-*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıbzadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*-*-*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*-*-*- | 25 qəp. | 25 qəp. |
| Müəllimüş-şəriə (birinci hissə) | -*-*-*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüş-şəriə (ikinci hissə) | -*-*-*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıbzadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*-*-*- | 5 qəp. | 5 qəp. |

***Şagird dəftərləri: idarədə yüz dənəsi 2 manat 40 qəpik.***

**ОСЕННЫЙ ТЕЛЯТНИКЪ**
**Живописцева въ г.ОРЛЕ**

***50 adama çatan mayenin şüşəsi - 25 qəpik, 25 adama - 15 qəpik, 5 adama çatan maye - 5 qəpik bir manatdan əskiyə göndərilməz. Göndərmək xərci 30 qəpik. 3 manata və artıq istəyənlərə 20 prosentə qədər tənzil verilir. Adres: Oryol, Jivopistsevin çiçək mayaxanası.***



IV ГОДЪ ИЗДАНИЯ № 7 ФЕВРАЛЯ 15-ГО 1909г.

# "Молла Насреддинъ"

*КОНТОРА и РЕДАКЦИЯ журнала "Молла Насреддинъ" Тифлисъ: Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

*ЦѢНА на ГОДЪ*
*Съ доставкою..............5 руб.*
*За границу....................6 руб.*
*ЦѢНА за ОБЪЯВЛЕНИЯ*
*За место занимаемое строкою петита впереди текста .....10 коп.*
*позади * * * .....7 коп.*

"Molla Nəsrədin"in əvvəlinci və üçüncü ilinin cildlənmiş kitabları və boş cildləri satılmaqdadır. Cildlərin üstündə Mollanın şəkli və adı, məcmuənin tarixi qızıl vərəq ilə basılıbdır. Qiymətləri idarədə: əvvəlinci ili 6 manat, üçüncü ili - 6 manat yarım, boş cildi - 70 qəpik, poçta xərci ilə: əvvəlinci ili - 6 manat yarım, üçüncü ili - 7 manat, boş cildi bir manat.

İkinci ilin kitabları bu yavuq vaxtlarda hazır olacaq.



Nikah məcəlləsi




Mərsiyəxanlar



Osmanlıda salamlaşmaq üsulu

Batumda Acara mahalında mollalar və rəiyyət

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərdə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д.24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**
**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**14 səfər 1327, bazar** **Həftədə bir dəfə çıxan türk məcmuəsidir** **22 fevral 1909**



## GƏNCƏDƏN

**"Tərəqqi" qəzetinə**

Möhtərəm "Molla Nəsrəddin" məcmuəsinin 4-cü nömrəsində Gəncədən yazılmışdı ki, mənim evimdə mərsiyəxan minbərdə cəmi tərəqqi və hürriyyət tərəfdarlarını, xüsusən məşrutəpərəstləri və hamı qəzetə yazanları təkfir edib camaata lə'nət oxudur. Çünki məqalə yazan həqiqətini yazmamışdı, ona görə bir-iki kəlmə bu barədə yazmağı özümə izin verdim.

On il var ki, validəmiz evdə on gün məhərrəmi məxsusi və biqərəz, bimənfəət öz xərci ilə İmam Hüseyn tə'ziyəsi tutdurur. Xahiş edənlər bu tə'ziyəyə təşrif gətirirlər. Üç-dörd ildən bəri tə'ziyəyə təklif olunan mərsiyəxanlar da zəmanənin təqazasına görə tərəqqipərvərlərə və hürriyyətpərəstlərə əl götürüb dua etməkdədirlər. Həmçinin bu il oxuyan mərsiyəxan da hər gün tərəqqipərvərlərə və Gəncədəki təzə məktəblərə rövnəq verənlərə dua edirdi. Amma məhərrəmin yeddinci günü mərsiyəxan "Molla Nəsrəddin"in ikinci nömrəsində yazılan misraı "necə qan ağlamasın daş bu gün, qırxılır gör neçə min baş bu gün" barəsində "Molla Nəsrəddin" qəzetəsinə bir neçə sözlər deyib camaata təklif edib ki, almıyın və oxumuyun "Molla Nəsrəddin" qəzetəsini!

Bu sözlərin cavabını o biri gün həm camaata, həm mərsiyəxana yetirdim. Çünki "Molla Nəsrəddin" söhbəti olan günü bəndə evdə olmamışam. Camaat yığılan vaxt "Molla Nəsrəddin"in təzə poçtdan gəlmiş nömrəsini əlimə alıb demişəm camaata ki, bu jurnalı cəmi sahib-savad müsəlmanlar oxuyurlar və oxuyacaqlar. Əzon cümlə bəndə. Mərsiyəxana lazım deyildir ki deyə almıyın və oxumuyun. Mərsiyəxanın özünə də tapşırdım ki, "Molla Nəsrəddin" söhbəti dübarə bizim evdə danışılmasın. Haman gün mərsiyəxan minbərdə camaata dedi ki, mənim dilimdən iftira düzəldiblər. Mən o cürə deməmişəm ki, camaat içində danışılır. Mən "Molla Nəsrəddin"i oxuyanlara lə'nət deməmişəm. Əhvalat bu gunə oldu qurtardı. Tərəqqi və hürriyyətpərvərlərin, məşrutəpərəstlərin və qəzet yazanların barələrində heç bir kəlmə mərsiyəxan bizim evdə nalayiq söz danışmıyıb.

**Adilxan Ziyadxanov**

("Tərəqqi", nömrə 36)

..........................

İdarədən: Həmin məktubu Adilxan cənablarının xahişinə görə məcmuəmizdə çap etməyi lazım bildik.

## CAVAB

"Molla Nəsrəddin" nam qəzetənin 5-ci nömrəsində 7-ci səhifədə Qasımkənd ləzgiləri imzası ilə bizim aramızda doğruluq ilə mütəəssif alicənab-fəzilətli divanbəyi Hacı Əlinin əleyhində yazılmış və böhtanlar ilə məşhun və məmlüvv olunmuş bir məqaleyi-nasadiqəyi oxuduq:

Filhəqiqə məzkur zati fazil divanbəyi şəriəti-qərrayə və nizami-padşahiyə müxalif rüşvətdən və rüşvətə müşabeh şeylərdən xali və bəid olmasını biliriz.

Və heç heylə nalayiq işlərə qarışmıyanı da biliriz. Və bundan sonra da heylə qəbih və məzmum fe'llərdən də əb'əd olmasını da ümid edəriz.

Binaənileyh "Molla Nəsrəddin" müdirindən təvəqqeyi-əkid olunur ki, həmin sətirləri mübarək "Molla Nəsrəddin"in bir guşəsinə dərc və daxil eliyə.

Həmin məktubda on iki nəfər adamın imzası var.

## ƏDƏBİYYAT

Bir bəhanə əldə ünvan etməli
bundan sora,
Büsbütün məxluqə e'lan
etməli bundan sora.
No üsulun şe'rə bərəks
olduğun izah edib,
Köhnəni tətbiqi-Qur'an etməli
bundan sora.
Xassə bu jurnal, qəzet
əmrində bir fitva tapıb,
Səddi-rahi-nəşri-irfan etməli
bundan sora.
Boylə iş, bunca qəzet, bunca
mazet olmaz, canım,
Bunları məhkumi-bütlan etməli
bundan sora.
Din gedir, məzhəb gedir, qədri
itir mollaların,
Çareyi-əmri-müsəlman etməli
bundan sora.
Hər yetən kəndin mühərrir
əded edib min söz yazır,
Bunları mətrudi-övtan etməli
bundan sora.
Kəsməli hər növ ilə olsa
nüfuzin, hörmətin,
Sərbəsər avareyi-nan etməli
bundan sora.
Cırmalı dəftərlərin, sındırmalı
çərnil qabın,
Fikri-tərvici-qələmdən etməli
bundan sora.
Mümkün olsa lap kökündən
qaldırıb bir zənn ilə,
Cümlə mətbuatı viran etməli
bundan sora.
Sima şairləri hökmən və
hətmən, zor ilə,
Xaric əz-islamü iman etməli
bundan sora.
Müxtəsər, hər kim ki gördün
fəhmi var, bir söz qanır,
Küfr ilə məşhuri-dövran etməli
bundan sora.
Arqadaşlar! Əl'aman, gəl tez
verib də əl-ələ,
Həm bu yolda əhdü peyman
etməli bundan sora.
Aid olmur indi bunlardan bizə
bir mənfəət,
Pul verərlərsə müsəlman
etməli bundan sora.

**Əbunəsr Şeybani**

## VƏSSALAM

Vəssalam? Vəssalam? Elə bu? Bəli, elə vəssalam. Başağrısı olmasa, əhvalatı başdan nağıl elərəm.

Neçə il bundan qabaq biz yazıq camaat yetmiş manat yığıb tapşırdıq Şeyx Əli Hacı Həsənəli oğluna ki, saxlasın və məscidin bir yeri xarab olsa sərf edək. Bu il haman yetmiş manata istədik ki, məscidi tə'mir edək. Şeyx Əli bizə cavab verdi ki, mənim oğlum Molla Həsən sizə mərsiyə oxuyub, yetmiş manatı çıxıram oğlumun zəhmətinə, vəssalam. Biz soruşduq ki "Cənab Şeyx Əli, elə vəssalam?" Şeyx Əli cavab verdi ki, "Bəli, vəssalam". "Elə vəssalam?" "Bəli, vəssalam".

Dəxi bundan artıq ərzimiz yoxdur.

Yə'cucistan mahalında biçarə Əylis camaatı tərəfindən.

**Vəssalam**

## MƏ'RƏKƏ

Şuşa şəhərində bu günlər böyük bir mə'rəkə üz verib. Axşam saat 9-da ya 10-da şəhərin böyük küçəsində 18 yaşında bir cavan başlıyıb çığırmağa ki: "Ay aman, məni qurtarın". Məhəllə əhli elə güman eliyiblər ki, bəlkə bir özgə iş vaqe olub, çünki bura Şuşa şəhəridir, müsəlman vilayətidir, oğlan özü də cavan, gecə vaxtı, tək və tənha... yə'ni, məsələn, filan və behman.

Amma axırda görüblər ki, elə bir xata yoxdur, ancaq yazıq oğlan qurşağına kimi düşüb batıb palçığa, yə'ni şəhərin mö'təbər küçəsində.

Eybi yoxdur, müsəlman vilayətidir, həmişəki işlərdir, təəccüb eləmək lazım deyil.

Genə allah rast saldı ki, biçarə cavan özgə xataya rast gəlmədi, çünki gecənin qaranlığı, özü də müsəlman şəhəri, uşaq da tək və tənha. Vallah, xatadır. Allah rast saldı.

**Cırcırama**

## TƏƏCCÜB

Doğrudan, çox təəccüb ki, necə qorxmurlar?

"Din və məşəqqət" məcmuəsi 6-cı nömrəsində yazır ki, "bu Avropa müqəllidləri bə'zi müdərris və müəllimlər ki övrətlərini və qızlarını götürüb teatrlara gedirlər - bunlar yövməl-məhşərdə xuda hüzurunda rüsvayi-aləm olmaqdan necə qorxmurlar?"

Doğrudan, necə qorxmurlar? Mən də həmişə təəccüb eləmişəm ki, bizim Qafqazda da bir para Avropa müqəllidləri və Avropa elmlərini oxuyanlar övrətlərini və qızlarını götürüb teatrlara aparırlar.

Doğrudan, görəsən bunlar məhşər günü rüsvayi-cahan olmaqdan necə qorxmurlar?

Çox-çox və çox təəccüb eliyirəm ki, necə qorxmurlar?

Ay başın batsın!

**Hərdəmxəyal**

## ZƏNCİR

"Tərcüman" qəzetəsinin dediyi kimi, bilmirəm, bizim Qafqazda və bilxassə Tiflis şəhərində nə hal var ki, burada hər yerindən qalxan "millətin qabağa" getməməsini müsəlmanların əlifbasına, imlasına isnad edərək, bunların başına gətirmədikləri oyun qalmır. Mirzə Fətəli, Mirzə Rza, qospodin Şahtaxtinski həp Tiflisdə törüyorlar!.."

Bu sözləri yazır "Tərəqqi"nin 31-ci nömrəsində möhtərəm ədibimiz Əlibəy Hüseynzadə cənabları.

Doğrudur, Qafqazda çox qəribə hal var, amma tək bir Tiflis deyil. Qafqazın Bakı şəhərində də bir qəribə xasiyyət var ki, hər bir əhli-qələm Bakı şəhərinə daxil olur, bir kəlmə söz ilə də, bir işarə ilə də istəmir "cərgə"dən bir qədəm kənara çıxsın və yazdıqlarını əvvəl bir qoyur qabağına və öz-özü ilə məsləhət eliyir ki, "görüm bu yazdıqlarım qoçubaşılarına, mərsiyəxanlara və qəssablara xoş gələcəkmi?" Elə ki görür "xoş gələcək", götürüb verir mətbəəyə ki düzüb çap eləsinlər.

Bu sözlər dəlilsiz deyillər.

Mə'lum şeydir ki, alimlərimiz və şöhrətli yazıçılarımızın çoxu Bakıdadırlar. Tiflisdə və qeyr şəhərlərdə ancaq Mirzə Fətəli kimi və Şahtaxtinski kimi xırda-mırda yazıçılarımız olub. Nə vaxt Bakıda təzə söz, təzə bir fikir, təzə bir məsələ ortaya qoyulub? Tutaq ki, bu məsələləri qalxızanlar "hər bir yerindən qalxan olub", bəs məsələlər özləri necə?

Biz inana bilmənik ki, məsələn, hicab məsələsini Hüseynzadə cənabları o cür başa düşür, necə ki içində yaşadığı Bakı camaatı. Amma Bakı camaatı bunu bilmir, o səbəbə ki, bu barədə Hüseynzadə cənablarını da öz "cərgə"sində görür. Qızlarımızı 9 yaşında ərə verib məktəb əvəzinə bir pəhlivanın otağına köçürtmək məsələsi düşüb, nə danışıblar bu barədə Bakı alimlərimiz? Yoxsa bunlar hamısı xırda işlərdir? Tiflis "yerindən qalxanları" əlifba məsələsi başlıyıblar. Başlıyanlar hələ heç, pəs məsələnin özü necə?

Biz buna təəccüb etmirik ki, Hüseynzadə cənabları əlifbamızın bilmərrə dəyişilməyinə fitva vermir, ondan ötrü ki, Bakıda otura-otura belə sözləri birdən-birə danışmaq olmaz. Bakıda ancaq müəllimlərin kitablarının bir neçə qüsurunu bəhanə eliyib Abdulla Cövdətdən izin almamış yazdıqları kitabın üstünə qələm çəkmək olar.

Biz buna təəccüb eləmirik. O şey ki biz ona təəccüb edirik - budur:

1. Əgər yer üzündə cəmi millətlərin əlifbasını qabağımıza qoysaq, baxıb görərik ki, qədim farsların "mixi" yazılarının, hindilərin "divanağari" əlifbasının, yaponların "kataqana" əlifbasının, ermənilərin, yəhudilərin, rusların "Kiril" əlifbasının və bütün Avropa əlifbalarının içində tək bircə biz işlətdiyimiz "nəsx" (ərəb) əlifbasıdır ki, başda yazılan hərflər bir cür yazılır, ortada bir özgə cür, axırda özgə bir cür və əlahiddə yazılanda da bir (özgə) cür yazılır. Mən elə qanıram ki, bu cür əlifbanın sahibi bəlkə "Heroqlif"ə də gərək şükür eləsin.

Təəccüb ki, Hüseynzadə cənabları bu barədə bir söz danışmır.

2. Möhtərəm ədibimiz ingilislərin imlasının adını qoyur "əcib", amma bizim imlaya heç olmasa "bir az əcib" də demək istəmir. Bunun eybi yoxdur: bizə mümkündür bu şəkkdən çıxmaq. Amma bu cür təzə xəbəri verən qörək unutmuya ki, indi "Tərəqqi"də bu müjdəni eşidən uzunətəklər çıtmıq çalıb oynuyurlar ki, "bax, biz nə qədər ingilislərdən xoşbaxtıq".

3. Hüseynzadə cənabları deyirlər ki, əlifbanın çətinliyi tərəqqiyə mane ola bilməz və buna da yaponiyalıların mədəniyyətin "övci-balasına" çıxmaqlarını dəlil gətirir. Əvvəla, məqalə sahibi oxuculardan bunu gizlədib ki, yaponiyalılar bu saat bu fikirdədirlər ki, qədim əlifbaları ilə yazılmış kitablarını cırıb yandırsınlar və "latın" hürufatını işlətməyə başlasınlar ("Qranat"ın qamusül-ə'lamı, cild 8, səhifə 5346). Bundan belə anlaşılır ki, hələ yaponiyalılar "övci-balaya" çıxmıyıblar, çünki indi övci-balada olmuş olsalar, elədə təzə əlifbanı qəbul eliyəndən sora gərək uçub qalxalar havaya. Saniyən, tutaq ki, mən görürəm mənim yoldaşım ayağında zəncir "bir fənd"lə çıxıb bir divarı aşdı o tərəfə. Məgər dəxi mən ayağımdakı zəncirdən xilas olmağa gərək çalışmıyam?

4. Əlifbanı akademiyalar dəyişməz və əsərlərini Əbdülhəmid xan saniyə "təqdimi-naçizi-übudiyyətkaranə" edən Şəmsəddin Sami kimi "ərbabi bulunan zəvat" dəyişməz. Ərbablar və akademiyalar əlli və yüz ildən sora görəcəklər ki, Mirzə Fətəlilər və qospodin Şahtaxtinskilər yuxudan gözlərini açan qırmızısaqqalların hümməti ilə əlifbanı dəyişiblər. Tutaq o və'də akademiyalar və "ərbab"lar bir az güləcəklər, amma belə işlər tarixdə görsənən bir haldır: 17-ci əsrdə ən şöhrətli təbib professor Riolan inana bilmirdi ki, "Qarviyer" kimi bir namə'lum şəxs bədəndə qanın hərəkətinin qanununu və hikmətini kəşf edə bilə (Pisarevin əsərlərinin 4-cü cildinin 474-cü səhifəsində belə təmsillər çoxdur).

Bu sözləri yazandan sora biz özümüzü borclu bilirik bunu da deməyə ki, "İkinci il" kitabının Hüseynzadə kimi bir ədibin tərəfindən tənqid olmasına biz kitab sahibləri ilə bir yerdə hər halda təşəkkür etməliyik və haman tənqiddə göstərilən qüsurların bir neçəsini təsdiq eliyirik.

Bu bəsdir.

Dəxi bu barədə bundan artıq danışmağa məcmuəmizdə yer yoxdur. Lakin ümidvarıq ki, yoldaşımız Ne'manzadənin bu xüsusda dəxi təfsilli cavabını oxucularımız "Tərəqqi"də oxuyalar.

**Molla Nəsrəddin**

---

Həmin fevral ayının 24-də Artistiçeski obşestvanın zal otağında Tiflisdə hər iki müsəlman cəmiyyəti-xeyriyyələrinin mənfəətinə müsəlman axşamı (veçer) olacaq. Biletlər satılırlar: Veçerin müdirəsi Tağıyeva Xanımın evində (Krılov küçəsi, öz evi). İran konsulxanasında (Beybutovski küçədə, nömrə 23) və Qafqaz müsəlman cəmiyyəti rəisi İbrahimbəy Vəkilovun evində (Uçebni pereulok, nömrə 8). Biletlərin qiyməti 2 manat 10 qəpikdir.

## ANCAQ ÜÇ ADAM

Maşallah, yaxşı keçdi, o qədər zərər olmadı, ancaq üç adam yaralandı, biri mərhum oldu, ikisi də yatır: biri övrət, biri də uşaqdı. Oxucular elə xəyal eləməsinlər ki, qoçu davası düşüb. Xeyr, ziyarət işidir, Kərbəla müsibətidir, axirət işidir, savab işdir, feyzi hədsizdir. Genə oxucular elə bilərlər ki, Məşqətədə aşura günü müsəlmanların gülləbazlığını deyirəm. Xeyr, mən dediyim budur ki, bir neçə gün bundan qabaq Suraxanı camaatı yığışmışdı vağzala ki, Kərbəladan gələn mübarək həmşərilərini ziyarət etsinlər. Bəli, kərbəlayılar vağzaldan düşdülər və yola çıxan kimi camaat başladı gülləbazlığı, çünki bizlərdə adətdir: toyda bəy hamamdan gələndə və birisi uzaq səfərdən gələndə güllə atallar.

Xülasə, naqafil güllələr gedib dəydilər bir neçə adama, necə ki yuxarıda ərz elədik.

Yə'ni mən demirəm ki, güllə atanların bir günahı var. Xeyr, bunlar hamısı əcəl işidir. Yoxsa güllə mənə niyə dəymədi ki, mən də orada idim. Qərəz, bu işləri bilmək olmaz. Amma burası var ki, biz çox xoşbəxt millətik, çünki maşallah, hər işimiz toy-bayramdı: tə'ziyəmiz də toy-bayramdı, ziyarətimiz də toy-bayramdı, özümüz də toy-bayramıq.

Mən ancaq bunu demək istəyirəm.

**Dəmdəməki**

## DAŞKƏNDDƏ CİCİLƏR!

1-ci küknaçı, əfyunçu, bəngçilərdir.

2-ci köhnəçi, mədrəsçi, işançılardır ki: bunlar əskilik, bəddualıq, tamahçılıq eləci tokub, insaf, həqqaniyyət, mədəniyyəti-insaniyyətə səd çəkirlər!

3-cü oyunçu, boğan qırsaçı, mollanümaçı, uzunçapan ağ faqildrokçu, astramavokçu, misyonerlərdir ki, bunlar danosçuların toxub, müsəlmanların tərəqqi yolların bənd eliyirlər!

4-cü bayçı, mənə cinçilərilə sipərgərdan olub əgər də bir tərəfdən islamçılarına şö'lə düşə haman belçıqçı buyurub bərkitdirirlər!

5-ci fəqərəçi, yamaqçı, xırçı, hambalçılardır ki, bunlar "əlfəqiri-fəxri" kəlməsin fişanələrinə yazıb qoyan kimi bir surəti və yüzdən ibarət olub, bunlar insaniyyət məişətçilərin tarmar etməkdədirlər.

**Cici bir dükançı**

## POÇTAXANA

Mən indiyə kimi hələ qana bilməmişəm ki, bu poçtaxananı urus nədən ötrü icad eliyib. Deyirlər ki, hələ Avropada bundan da dəstgahlı poçtaxanalar var. Genə dəmir yolu olmuya, araba yolu olmuya, adamların tərəddüdü olmuya - o ve'də tutaq ki, hələ bir yana pul göndərmək ya kağız göndərmək üçün bəlkə poçtaxana lazım ola. Amma indi ki hər gün İrəvandan Tiflisə gedən var, Tiflisdən Gəncəyə gedən var, Şəkidən Şirvana gedən var - dəxi poçta nəyə lazım? Kağız göndərəcəksən, ya pul göndərəcəksən, ya şey göndərəcəksən, çıx bazara, soruş gedən kimdi - ver aparsın - dinməz-söyləməz, xərcsiz və zəhmətsiz.

Yə'ni, maşallah, bizim müsəlmanlar bu mətləbi çoxdan başa düşüblər və necə ki mənim səliqəmdi, onlar da elə rəftar eliyirlər.

.......

Bizim başımıza bu cür işlər çox gəlir. Gün olmaz ki, idarəmizə bir belə kağız yazmasınlar: "Cənab Molla Nəsrəddin, mən Kərbəlayı Əli Hacı Allahqulu oğlu Məşədi Cəfərə 5 manat verdim ki, gətirib yetirsin sizin xidmətinizə. Sizdən təvəqqə edirəm ki, pulu alan kimi mənim adıma İrəvana mübarək olan məcmuənizi əvvəlinci nömrədən başlıyıb göndərəsiniz".

Çox əcəb. İki gün keçir, xəbərimiz olur ki, "Qeyrət" mətbəəsinə bir nəfər adam gəlib və deyib: "Mən Molla Nəsrəddini görəcəyəm". Bəli, cavab veriblər ki, Molla Nəsrəddin filan məhəllədə, filan küçədə olur. İki gün keçir, mətbəədən bizə sifariş eliyirlər ki, haman irəvanlı genə fayton ilə gəlib Molla Nəsrəddini soruşurmuş. Genə cavab veriblər ki, Molla Nəsrəddin filan yerdə olur. İki gün də keçir. Bir də görürsən ki, Davıdovski küçəyə fayton ilə bir müsəlman gəlir, küçənin ortasında faytonu saxlıyıb Molla Nəsrəddini xəbər alır. Axırda nə zəhmətlərdən sora haman şəxs gəlir çıxır Mollanın idarəsinə. Salaməleyküm - əleykəssalam. Haralısan? İrəvanlı. Adın nədir? Məşədi Cəfər. Nə qulluq? Bir elə qulluq yoxdur, ancaq, ay Molla, allah sənə insaf versin, mən sizdən ötrü bir həftədir Tiflisdə məəttələm. Neçə dəfə fayton ilə mətbəəyə getmişəm, sizi tapmamışam. İki dəfə də fayton ilə idarənizə gəlmişəm, deyiblər ki, Molla hamama gedib.

Bəli, bağışlayınız, indi nə qulluq? Xeyr, bir elə qabili-ərz yoxdur, ancaq nökərə buyurun mənə bir stəkan su gətirsin - ürəyim yanıb. Bu gün səhərdən sizi gəzirəm, çünki Kərbəlayı Əli Hacı Allahqulu oğlu sizə 5 manat məcmuə pulu göndərib. Pah, pah, lap yorulmuşam.

.......

Bir gün Salyandan bir belə kağız alırıq:

"Cənab Molla Nəsrəddin, mən bu gün burada bəradərani-Hüseynovlara otuz altı manat verdim ki, eləsin məcmuə pulu və kalendar pulu, siz orada

cənab Hüseynovların şəriki cənab Hacı Ələsgər Hacı Nəcəf oğlundan alasınız".

Bu kağızı alıb biz gərək adam göndərək Şeytanbazarına ki, görsün cənab Hacı Ələsgər Hacı Nəcəf oğlu salyanlı kimdir? İki saat gəzib-dolanandan sora göndərdiyim adam gəlib deyir ki, "tapa bilmədim". Sabahısı günü genə haman adamı göndəririk ki, gedib yaxşı axtarsın. İki saatdan sora gəlib deyir ki, Hacı Ələsgər Nəcəf oğlu özü dükanda deyil idi, getmişdi hamama, şagirdi də dedi ki, "mən bilmənəm". Bir gün keçir, genə adam göndəririk. Hacı Ələsgər Nəcəf oğlu deyir ki, "mənə bu barədə bəradərani-Hüseynovlardan bir sifariş gəlmiyib, gələndən sora baş üstə, verərəm". Bir həftə gözlüyüb genə adam göndəririk. Hacı Ələsgər cavab verir ki, "sən get, mən pulu özüm gətirrəm Mollanın xidmətinə".

Bir neçə gündən sora haman Hacı bir fayton tutur yarım manata, oğlunu və şagirdini mindirir haman faytona və cavanlar Davıdovski məhəlləyə düşüb qaradovoylardan müsəlmanca "Molla Nəsrəddin" idarəsini soruşurlar. Bəlkə bu dəfə tapmıyıb geri qayıdırlar, amma ikinci dəfə gəlib tapırlar və böyük mə'rəkə və qışqırıq ilə girirlər içəri, kəhildiyə-kəhildiyə otuz altı manat çirkli dəsmalın içindən çıxardıb qoyurlar stolun üstünə və bir stəkan soyuq su içəndən sora və Yezidə lə'nət oxuyandan sora deyirlər ki, "bu pulu iki həftə bundan qabaq sizin Nuxa vəkiliniz verib bəradərani-Hüseynovlara ki, sizə yetişsin".

.......

İnsafən, müsəlmanları qınamaq olmaz, çünki poçta ilə pul göndərmək çox çətindir. Gərək üç şahı verib bir "perevod" kağızı alasan, üstündə rusca yazasan ki, bu pul gedəcək Tiflisə "Molla Nəsrəddin" idarəsinə, filankəsin tərəfindən. İnsafən, çox çətin işdi, ələlxüsus, ticarət aləmində də bu cür işlər heç əl verməz: ticarət hara, poçtaxana hara? Allah rəhmət eləsin o kəslərə ki, müsəlmanlara rusca oxumağı haram buyurublar. Qafqazda bir tacir yoxdur ki, özbaşına poçtaxana ilə bir kəsə 5 manat göndərə bilsin.

.......

Mən istəyirdim bu gün politika aləmindən oxucularımız ilə bir az söhbət edəm. Məsələn, qəzetələr yazırlar ki, Avstriya ilə Serbiya hökuməti bu gün-sabah dava edəcəklər. Mən istəyirdim ki, həmin nömrədə cəfəngiyat əvəzinə bir siyasi məqalə yazam, məsələn, heç olmasa yazam ki, Avstriya və Serbiya nə üçün dava edirlər, yazam ki, Avstriya nə deməkdir, Serbiya nədir, bunların ədavəti nə vaxt və haradan başlanıb. İstəyirdim yazam ki, Serbiya bir balaca hökumətdir, dörd yüz ildən artıq Osmanlı vilayəti hesab olunurdu və ildə bir dəfə osmanlı soltanları, paşaları və yeniçərləri göndərib serblərin bir az başlarını tapdalıyandan sora gözəl qızlardan zaddan yığıb aparıb bir qədərini soltanların hərəmxanasına qatıb, bir qədərini özləri saxlıyıb məşğuliyyət elərdilər. Axırda qəza belə gətirdi ki, 27 il bundan qabaq Serbiya hökuməti çıxdı azadlığa və məşrutəli bir kraliça oldu. Hərçənd məxluqu iki milyondan bir az artıqdır, amma di gəl ki, başladılar məktəblər açmağa, darülfünunlar açmağa, axırda da işi o yerə yetirdilər ki, indi istiyirlər Avstriya kimi bir əjdaha ilə kəllə-kəlləyə vursunlar. Hə nə üstə? Bosniya üstə. Bosniya nədir?

Xülasə, istəyirdim buna oxşar bir söhbət başlıyam, amma öz-özümə dedim ki, ay Molla Nəsrəddin, sən dəlisən, nəsən? Bir camaat ki bir şəhərdən o biri şəhərə 5 manat göndərməyi bacarmır, - məgər bu cür camaat üçün rəvadırmı yazmaq ki, nə bilim Avstriya belə gəldi, Serbiya belə getdi? Sən onu de ki, İrəvandan Tiflisə və Şirvandan Qarabağa nə cür və nə qayda ilə 5 manat göndərmək.

Hələ qabaqca bunu bilmək lazımdır.

Genə deyəsən uzun oldu.

**Lağlağı**

## POÇTA QUTUSU

Karsda "Sadığ"a: Genə şükür eləmək lazımdır. Bəlkə Ordubaddan xəbərin ola?

Gəncədə "Xoca xoca"ya: Nahaq yerə gözləmə.

Nuxada "Qəşəng"ə: Çox da gəncəli məhəllәsindəki cindarınızdan dəm vurma. Novobayazit mahalındakı Hacı Mirzə Ələkbər ağaya çata bilməz.

Cavad uyezdində "Allanmayan"a: Məktubunuzu verdik çapa, amma o qədər uzundu ki, qorxuram, çap olunub qurtarmıya.

Batumda "Q" cənablarına: Gərək əhvalatı elə yazasınız ki, əvvəl biz özümüz başa düşək, sora biz də yazaq ki, xalq başa düşsün.

Səmərqənddə "Türküstan xəbərçisi"nə: Qazı Gilanın və Hacı Molla Püratın barəsində yazdığınız töhmətlər çox şiddətlidirlər. Təvəqqə edirik ki, işi diqqətli təhqiq eliyəsiniz.

Gəncədə "Divanə"yə: Sən kağızını yaza-yaza elə bilirdin ki, çap olunacaq, mən də oxuya-oxuya bilirdim ki, çap olunmuyacaq.

Bakıda "Şaki"yə: Elə yadıma gəlir ki, göndərdiyiniz şe'rlər "Qumru"nun kəlamıdır. Əgər belə olsa, əlbəttə, çap olunmuyacaq. Gələn nömrədə genə cavab verərik.

Müdir və baş mühərrir:
Cəlil Məmmədquluzadə.

**E'LANLAR**

Məhəmməd Hadi Əbdüssəlimzadənin 234 səhifədən mütəşəkkil "Firdovsi-ilhamat" nam məcmueyi-şe'riyyəsi mövqei-intişara qoyuldu. Qiyməti bir manat 40 qəpikdir. Arzu edənlər aşağıdakı adresə müraciət buyursunlar: Bakı, Bəradərani-Orucovların mətbəəsində Məhəmməd Hadi Əbdüssəlimzadəyə.

Баку, Типографія бр. Оруджевыхъ, Мухамедъ-Хади Абдуссалимъ-заде.

ÇAY QƏDRİ BİLƏNLƏR DİQQƏT ETSİNLƏR
ƏN Ə'LA ÇAY

Moskvada Vısotski və kampaniyasının çay şirkəti
**Т-ва чайной торговли В.Высоцкий и К$^{O}$. Москва.**
Sərmayəsi 10.000000 manatdır. İldə 40.000000 manatlıq ticarət eliyir. Yaxşılığı səbəbindən bizim şirkətin çayı nəhayət dərəcədə çox işlənir və bizim şirkət kimi heç kəs o qədər mal satmır. Çayımız çox rəngli və ətirlidir və bir dəfə imtahan üçün çayımızı içən həmişəlik müştərimiz olur. Ticarət nişanəmiz də həmişəki kimi olmağına diqqət eləmək lazımdır. Zaqafqaziya, Zakaspiya və İran üçün şö'bəmiz Tiflisdə Puşkin küçəsində nömrə 7-dir. Telefon nömrə 432.
Тифлисъ, Пушкинская ул., №7. Телефонъ № 432.

ВНИМАНИЮ БОЛЬНЫХЪ!!!

Въ виду появившихся въ продаже вредныхъ для здоровья подделокъ Спермина предлагаемыхъ подъ различными названиями, необходимо при покупке обращать внимание на название

**Сперминъ Пеля**
проф. доктора
**Sperminum poehl**

и требовать таковой в подлинной упаковке Органотерапевтического Института профессора доктора Пеля и сыновей въ С.-Петербурге.

Все имеющиеся въ русской и иностранной литературе многочисленные научные наблюдения выдающихся ученых и врачей над благотворнымъ действиемъ спермина при неврастении, старческомъ маразме, неврастеническомъ половом безсилии, при переутомлении и тяжких заболеванияхъ, какъ малокровии, рахите, подагре, храническом ревматизме, сифлисе, чахотке, брюшном тифе, расстройстве сердечной деятельности (миокордите, ожирении сердца), истерии, спинной сухотке, параличахъ и проч. Относятся исключительно къ спермину профессора доктора Пеля. Сперминъ - Пеля имеется во всех аптекахъ и большихъ аптекарскихъ магазинахъ: 1) въ виде капель (Essentia Spermini - Poehl) 1 флаконъ - 3 руб., а также 2) въ ампулахъ для подкожных вприскиванияхъ (Sperminum - Poehl pro inyectione) 1 коробка на 4 впрыск. - 3 руб. и 3) в виде клизмъ (Sperminum - Poehl pro clysm) 1 коробка на 4 клизмы - 3 руб.

При требов. литерат. высылающ. безвозмездно, просять указывать болезни для высыл. соответ. наблюд. врачей.

ОРГАНОТЕРАПЕВТИЧЕСКИЙ ИНСТИТУТЪ, ХИМИЧЕСКАЯ ЛАБОРАТОРИЯ И АПТЕКА ПРОФЕССОРА ДОКТОРА ПЕЛЯ И СЫНОВЕЙ ВЪ С.-ПЕТЕРБУРГЕ,
ВАС. ОСТР, 7 ЛИНИЯ, Д. №16-181

Наивысшие награды (Grands-Prix) на всехъ всемирныхъ выставкахъ и наилучшие отзывы медицинских авторитетов

**Badkubədə Mehmanxaneyi - "İslamiyyə"**
**Гостиница "ИСЛАМИЯ" въ гор. БАКУ.**
**Nömrələrinin qiyməti 1 manatdan beş manata qədərdir və aşpazxanamızda hər cür Asiya və Avropa xörəkləri mövcuddur. İstirahətini sevən müştərilərdən mehmanxanamızı bir dəfə gəlib görmələri rica olunur. Pasportsuz müsafirlər zəhmət çəkməsinlər, çünki divan hökmünə görə qəbul olunmuyacaqlar.**
**Adresimiz: Qubernski küçədə, Lalayevin evində Mehmanxaneyi-"İslamiyyə".**
**Sahibi-mehmanxana: İsmayıl Mahmudzadə.**
**Баку, Губернская ул., номера "ИСЛАМИЯ", телефон 1251.**

ŞTREYXERİN DİŞ MÜALİCƏXANASI

İrəvanskaya ploşad, Puşkin küçəsi tərəfindən
Эриванская площадъ съ стороны Пушкинская улица
Dişləri doldurur qızıl ilə, farfor ilə və qeyrə. Kauçukdan və qızıldan diş qayırır. Ağrısız diş çıxardır. Müalicəxanada məxsusi cərrah da var. Naxoşlar qəbul olunur sübh saat 9-dan axşam saat 8-dək. Qiymətlər taks iledir.

**ОСЕННЫЙ ТЕЛЯТНИКЪ**
**Живописцева въ г.ОРЛЕ**

*50 adama çatan mayenin şüşəsi - 25 qəpik, 25 adama - 15 qəpik, 5 adama çatan maye - 5 qəpik bir manatdan əskiyə göndərilməz. Göndərmək xərci 30 qəpik. 3 manata və artıq istəyənlərə 20 prosentə qədər tənzil verilir. Adres: Oryol, Jivopistsevin çiçək mayaxanası.*



*ТОРГОВЫЙ ДОМЪ*
*Бр. Едигаровы и Назаровы*
*Yedigarov və Nəzərov qardaşlarının ticarət evi.*
*Bu ilin yanvarın birindən Tiflisdə Sivinski küçədə 8-10 nömrəli evdə və İrəvan quberniyası Naxçıvan şəhərində manufaktura (parça) mallarının anbarını bina eləyib əlverişli qiymətlərə satırıq.*

1909-cu sənədə müsəlmanlara məxsus divar kalendarı gözəl rəvişdə çap olunub meydani-intişara qoyuldu. Orenburqda "Kərimov, Hüseynov və şərikası" dükanlarında satılmaqdadır. Müsəlman ayları ilə rus çisloları və müsəlman, rus bayramları ayrı yazılıbdır. Kalendarın dalında yazılan tərbiyeyi-əxlaqa dair məqalələr oxuyanlara böyük mə'lumat verəcəyinə əminik. Kalendarlar gözəlliyinə bərabər az qiymətə yollanmasından hər kəsə öz divarından birin asmağı tövsiyə edirik. Qiyməti poçta xərcilə dənəsi 25 qəpik, on dənəsi 2 manat, zadatka göndərənlərə naloj ilə də göndərilir.
Адресъ: Оренбургъ, Т-ву "Каримовъ, Хусаиновъ и К$^{O}$".

IV ГОДЪ ИЗДАНИЯ № 8 ФЕВРАЛЯ 22-ГО 1909г.

# "Молла Насрединъ"

*КОНТОРА и РЕДАКЦІЯ*
журнала
"Молла Насреддинъ"
Тифлисъ,
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

*ЦѢНА на ГОДЪ*
*Съ доставкою..............5 руб.*
*За границу..................6 руб.*
*ЦѢНА за ОБЪЯВЛЕНІЯ*
*За место занимаемое строкою*
*петита впереди текста .....10 коп.*
*позади " " " .....7 коп.*

"Molla Nəsrədin"in əvvəlinci və üçüncü ilinin cildlənmiş kitabları və boş cildləri satılmaqdadır. Cildlərin üstündə Mollanın şəkli və adı, məcmuənin tarixi qızıl vərəq ilə basılıbdır. Qiymətləri idarədə: əvvəlinci ili 6 manat, üçüncü ili - 6 manat yarım, boş cildi - 70 qəpik, poçta xərci ilə: əvvəlinci ili - 6 manat yarım, üçüncü ili - 7 manat, boş cildi bir manat.
İkinci ilin kitabları bu yavuq vaxtlarda hazır olacaq.







Həcdən qayıdanda




Mə"mur: Durun buradan köçün: bizim xaxollara yer lazımdır.

# ملا نصرالدين

№ 9. Цѣна 12 к. **МОЛЛА НАСРЕДДИНЪ** قیمتی ۱۲ قپک ۹





Ərəblinski: Teatrlarda o qədər xalqın müsibətini göstərdim ki, axırda öz başıma da gəldi! Ax,ax!
(Bakıda Tağıyevin teatrında "Yanğı" faciəsi)


Литог. С. Быхова




Oğul: Ala, bir abbası yerinə sənə beş manat verim.

**Сынъ**



Ata: Yox, yox, keşnişin dəstəsinə bir qəpikdən artıq verə bilmənəm.

**Отецъ**

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д.24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**
**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**21 səfər 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 1 mart 1909**



## ƏDƏBİYYAT

Qəmü möhnət füzun oldu,
Səbəb boynuyoğun oldu,
Əliflər döndü nun oldu,
Səbəb boynuyoğun oldu.

Nə üçün kişvəri-İran
Olur şəxsiyyətə qurban?
Məgər bayquş sevir viran,
Və ya tale zəbun oldu,
Səbəb boynuyoğun oldu.

Nədən oldu iki dilli,
Ürəklər qaldı niskilli?
Dağıldı məclisi-milli,
Ələmlər sərnigun oldu,
Səbəb boynuyoğun oldu.

Neçün məşrutə bağlandı,
Müzəvvirlər qoçaqlandı,
Qarınlar doydu, yağlandı,
Vətən darülcünun oldu,
Səbəb boynuyoğun oldu.

Qəsəm etdi, inandırdı,
Neçün rə'yin dolandırdı,
Özün dünyayə andırdı,
Mütii-nəfsi-dun oldu,
Səbəb boynuyoğun oldu.

Nədən ləğv oldu peymanlar,
Verildi odlu fərmanlar,
Bütün odlandı Qur'anlar,
Cinayət rəhnümun oldu,
Səbəb boynuyoğun oldu.

Nədən qalxışdı xulqanlar,
Satıldı pula imanlar,
Töküldü bigünah qanlar,
Ürəklər laləgun oldu?
Səbəb boynuyoğun oldu.

Nə üçün susdu natiqlər,
Alındı həbsə sadiqlər,
Fəqət bə'zən münafiqlər,
Varıb nurül-üyun oldu,
Səbəb boynuyoğun oldu.

Nədir təkfiri əxyarın,
Nədir təhqiri əbrarın,
Nədir təqsiri əhrarın
Ki boylə qərqi-xun oldu?
Səbəb boynuyoğun oldu.

Qüruri intəhasından,
Həya qılmır ədasından,
O keyfə-mayəşasından,
Neçin layəs'əlun oldu,
Bütün işlər oyun oldu,
Səbəb boynuyoğun oldu.

**Əbunəsr Şeybani**







## *İrəvan müxbirimizə açıq məktub*

Neçə həftə bundan qabaq idarəmizə göndərdiyiniz məktubda cənab Hacı Şeyx Ələkbər ağaya bir para nalayiq sözlər isnad etmişdiniz. Hərçənd sizi bir növ tanıyırdıq, lakin işi təhqiq etməmiş bu tövr ağır sözləri möhtərəm bir vücudun adına bağlamağı biz mümkün bilmədik və məsələni mühəmməl qoyub İrəvan camaatından cavab gözlədik.

Keçən həftənin müddətində İrəvan şəhərindən idarəmizə dörd məktub gəlib; hər məktuba çox imzalar qoyulub. Məktub sahibləri müttəfiqül-qövl yazırlar ki, cənab Hacı Şeyx Ələkbər ağa hər il bəliğanə moizələri ilə müsəlman camaatını ittihad və ittifaqa, tərəqqi və təməddünə tərəf çağırıb, hər yerdə və hər şəhərdə bir-birlərinə kömək etməyi təklif edir və hər halda belə iftiradan çox uzaqdır.

Bu sözləri yazıb sizə təklif edirik və məcmuəmizin on birinci nömrəsi çıxanadək sizə möhlət veririk ki, əgər yazdıqlarınız doğru isə, adbaad şahidlər ilə yazıb sübuta yetirəsiniz. Əgər sizdən bir cavab gəlməsə, yazdıqlarınızı böhtan hesab edib buna görə də rəftar edəcəyik.

**İdarədən**

## *"BADLOQ"*

**(Molla Nəsrəddinin lüğətindən)**

Çoxları yazıb bizdən "badloq"un mə'nasını soruşurlar.

Lazım bilirik burada bu sözü mə'na edək. "Badloq" iki sözdən əmələ gəlir: "bad" farsca "yel", "loq" yapon dilində "burun" deməkdir, badloq - yə'ni burun yeli.

Bu söz Qax vilayətində çox işlənir. Əhvalat bu qərar ilədir ki, keçənlərdə Çar bazarında məscidə vəqf olunan dükanların biri qalmışdı nahiyə qazisinin boğazında. Camaat Car mirovoy suduna ərizə verib xahiş etmişdi ki, sudya barmaqlarını uzadıb qazinin boğazından dükanı çıxartsın, qaytarsın camaata. Yazıq sudya da qalır məəttəl, çünki zakon kitablarına baxıb görür ki, belə bir iş heç yanda yazılmıyıb.

Axırda qazi özü də çarəsiz qalıb gedir bir kağız qayırır və camaatın əsl vəkillərinin əvəzinə üç nəfər adam tapıb deyir ki, allah xatirinə, siz gəlin yalandan sudyaya deyin ki, "biz camaat tərəfindən vəkilik və dükanın geri qayıtmağına razı deyilik". Bu barədə qazi bir badloq qayırıb qoyur sudyanın qabağına.

Fevralın on üçündə sudya badloq kağızına baxıb qaziyə deyir: "Üzün qara olsun".

Bəs, "badloq", yə'ni "burun yeli": və bəyanı da bu cürdü ki, qazi üç nəfər yalançı camaat vəkillərini tapıb təvəqqə eləmişdi ki, bunlar qazinin "badloq"una qol qoysunlar, yə'ni qazinin burnundan püfləsinlər ki, boğazında qalan dükan keçib getsin qarnına.

**Sofi zənbil**

## *HƏMŞƏRİ VƏ SALDAT*

**Saldat:** Həmşəri, zaçem tvaya qamsum tatar şaxsey-vaxsey başqa qinjal prapal.

**Həmşəri:** Ağa saldat, patamu qamsı tatar zorba başqa rejim rabatay; məsələn, erməni takoy çalavert, qorxax, musurman qorxax bilməz, patamu indi qamsım urus, firənk, erməni, gürcü pasmatri musurman şaxsey-vaxsey mnoğo-mnoğo kriçit, kriçit, başqa vsyo qinjal, başqa vsyo qəmə, rejim, rejim, şaxsey rejim, patamu vsyo ingilis, vsyo urus, vsyo firənk qamsum gəlib pasmatri kakoy zorba pasmatri musurmandan qorxub delayet, tvoyo urus şto? Burnundan adin nemnoşko qan gələn kimi kriçit, ay umirat, ay doxtor, umirat. Patamu musurman zorba.

**Saldat:** Paşol, durak, tvoya başqa saman, bolşe niçeqo.

**Həmşəri:** Ağa saldat, ağzını təmiz saxla.

**Dəli**

## *AFRİKA*

Bu il Şirvanda xummi-qədir günü camaat dükanların bağlıyıb cəm olublar Şeyx Minas məhəlləsinin məscidinə. Moizədən sora durublar üsuli-cədidə məktəbindən ötrü pul yığmağa və cənab Hacı Molla Qəni ağanın fərmayişi də belə olub ki, "məscidə gələn uşaqların başları qırxıq, əyinlərində çuxa, ayaqlarında başmaq gərək ola, belə olmasa mən pul vermiyəcəyəm". Bu əhvalatdan bir neçə gün sora sünni camaatı da şiələrin acığına məktəbdən ötrü neçə min manat cəm eliyib və hər iki tərəfin mö'təbər şəxslərinin məsləhəti belə olub ki, şiə məktəbi əlahiddə olsun, sünni məktəbi əlahiddə. Xülasə, məqsudum bular deyil. Ancaq çox təəccüb eliyirəm ki, Afrikanın səhralarında çəyirtgə, kərtənkələ, dəvə südü yeyən zəngibarlar "ittihad" kəlməsin başa düşüb bu köhnə naxoşluğu özlərindən tərk elədilər. Amma Şirvanın fisincan, mürği-turş yeyən mütəşəxxislərindən tərk olmadı. Genə də sağ olsun kərtənkələ yeyənlər.

**Qırxayaq**

## XARAŞO

Nuxada bir mö'min şəxs dəstəmaz alıb qurtarandan sora "xaraşo" deyibdir. İndi məclislərdə dəxi bundan savayı bir özgə söhbət yoxdur ki, görək aya, bu söz ilə o şəxsin dəstəmazı pozulur ya yox. İndi iki həftədir ki, Nuxa məclislərində, bazarda və dükanda bu söhbətdən savayı özgə bir söhbət yoxdur.

## ERMƏNİ

Bu gün qəzetələrin birində oxudum ki, bir erməni keşişi ölən vaxt cəmi var-yoxunu erməni milləti üçün məktəb açmağa vəqf eliyib.

Dünən genə bir qəzetədə oxudum ki, bir dövlətli erməni xanımı genə məktəblər açmağa çox pul ehsan eliyib.

İstəyirdim bu barədə bir neçə söz danışam, amma doğrusu, yadımdan çıxdı və ha fikirləşirəm, bilmirəm ki, nə demək istəyirdim. Təvəqqə edirəm ki, məni bağışlıyasınız.

**Dəli**

## ŞEYTAN

Vladiqafqazda "Mürüvvət" məclisi-xeyriyyəsi bina qoymuşdu ki, qurban dəriləri yığılıb satılsın və pulları verilsin məclisin nəf'inə. Bu xeyir bina rücu' olundu millət xadimlərindən birinə və camaat da xoşhallıqla dəriləri verdilər o cənaba. Amma, Molla əmi, bir çox qəribə iş oldu: qəfildən dərilər aralıqdan yox oldu: göyə uçdu, yerə getdi, cin apardı, şeytan apardı - heç yeri də mə'lum olmadı.

Amma bu il qurban dərilərimizi vermədik.

**Avam**

## MƏŞHUR ALİMLƏR
## (7-ci nömrədən sora)

Bəli, doqquzuncu erməni naxırçısı Soğomondur. Bu cənab da ə'la tas qurub cinləri cəm eliyib və özünə də mal yatağında dana surətində cin gəlib vergi verib, hətta yataqda mal neçə dəfə anqırsa bilir.

Onuncusu Mirzə İsmayıl namdır. Bu cənabın atası dəllək olub, çox ə'la neştər vuran olub. Hətta qocalardan eşitmişik ki, hərgah bir adamın başı ağrısaydı topuğundan qan alarmış, ona görə ki, hər dərd adama ayaqdan gəlir: gərək əvvəl dərdin yolunu tapmaq; ondan sora müalicə etmək lazımdır. Xülasə, əl'an müşarileyhin bir oğlu var, həm cərrahlıq elmində fərzaneyi-əsrdir, özü də Əflatun-fikir, Ərəstu-kirdar bir vücuddur. Allah-taala həzrətləri misalların çox eləsin.

On birinci Cabbar əmidir. Dəxi bunun tə'rifini eləməyə söz tapa bilmirəm.

On ikinci Hacı Talıbın oğlanlarıdır. Bu cənablar da atadanqalma bir nüsxə ilə həkim olublar: nağıl eliyirlər ki, mərhum Hacı Talıb bir vaxt xəstə olub, ona birisi bir nüsxə verib. O nüsxə bunun təbiətinə saz gəlib, onun ilə həkim olub. Nüsxənin məzmunu bu qərar ilədir: qursi-kəmər, zavənd təvil, çubi-çini, zəncəbil, darfilfil, xulincan, şir tərəci-hindi - bu davacatı iyirmi stəkan suyun içində qaynadıb hər gün üç stəkan içə.

On üçüncü təbib və dərman satan Əliqulu namdır. Bu cənab ə'la şairdir və dua yazandır və həm ələfşünaslıqda bu cənabın yədi-beyzası var və ələfiyyatın hamısını Şamaxı torpağından tapıb (allah bərəkət versin).

(Mabə'di var)

**Kəlniyyət**

## SAQQAL

Axund əmi, mən, canımda nə qədər ki, nifrətim var və olacaq, hamısın o xəbərçi oğlu xəbərçi "Türküstan xəbərçisi"nə izhar edirəm. Ondan ötrü ki, doğrudur, mən qramofon satıram, amma burası var ki, mən "üzü qırxıq" deyiləm. Hamı görür ki, mənim saqqalım var. İstədim əksimi saldırıb göndərim, salasan jurnala ta hamı görsünlər. Doğrudur ki, əgər biz götürək tamam insanları "təkmə cüt" eliyək, görərik ki, insanların üç hissəsi "üzü qırxıq"dır, onda anlarıq ki, pəs insanlıq saqqal ilə deyil. Axund əmi, öz canım üçün, bunu oxuyandan bu yana elə acığım tutur ki, az qalıram ki, gedim saqqal səhldir ki, bığlarımı da qırxdıram. Amma özünüz bilirsiniz ki, buralarda birisinin saqqal və bığı ki olmadı, əgərçi həştad yaşı da olsa işi xarabdır, çünki "müsəlmanlıq" bə'zi yerlərdə saqqal ilə, bə'zi yerdə əda və qəba və şal və əmmamə ilə olan kimi bizim buralarda buların hamısı ilədir: - "ibadət be əmmamə və dəlq nist - ibadət becüz xidməti-xəlq nist" şe'rlər bizim yadımıza da düşmür. Qərəz, yalvarıram, bu kağız əlinizdən səbətə düşməsin ki, allah o "Türküstan xəbərçisi"nin atasına lə'nət eləsin ki, bizi rüsva elədi. Molla əmi, mən ölüm, yaz.

**Qramofonçu**

## "İTTİHADİ-İSLAM!"

Bu günlərdə "İrkutsk quberniyasında Verxolinski uyezdində Matrurka deyilən yerdən bizə belə bir kağız gəlibdir. Kağızı yazan bizim mö'təbər tanışlarımızdan birisidir ki, orada ticarət ilə məşğuldur. Kağızın məzmunu belədir:

Əzizim Molla Nəsrəddin!

Cənabınıza mə'lum olsun ki, bu gün biz Xarabatda olduğumuz halda bizə xəbər verdilər ki, Manzurkada olan qafqazlı Məşədi Oruc vəfat edibdir. Biz də bir-iki nəfər durub getdik Manzurkaya ölünü dəfn eləməyə. Gedib gördük ki, biçarə üç gündür vəfat edəli; lakin orada yerli olan tatar müsəlmanlar buna yaxın durmurlar, deyirlər ki, bu qızılbaşdır, kafirdir. Elə ki biz oraya getdik, oranın mollası Hacı Molla Ziyaəddin əfəndi bizdən yüz manat pul istədi ki, ölünü götürsün. Biz yüz manat verdik. Əfəndi ölünü xah nə xah götürdü, apardıq tatar qəbiristanlığına basdırmağa. Tatar müsəlmanlar bizi qoymadılar ki, ölünü qəbiristanlıqda basdıraq; genə dedilər ki, bu ölü qızılbaşdır, bunu biz qəbiristanlığımıza qoymarıq. Çünki bizim ölülərimizi tovladıb yoldan çıxardıb cəhənnəmə aparar.

**Əztərəfi Abuzər Yusifov**
**Gəncəyi**

**İdarədən:** Bir yerdə ki Hacı Molla Ziyaəddin kimi bir fanatik şarlatan molla ola, daha elə yerdən bundan artıq heyvaniyyət gözləmək olmaz.

**Məşədi Sijimqulu**

## ŞEYX

Dünyada nə mətləbin var isə, necə çətin işlərin var isə, sidqidilnən gəl Şeyx Hacı Məhəmməd həzrətlərinin yanına. Sənin canın üçün, şeyx gələcəyi, hamısını bilir; başına qara salıb cənnəti də görür və cənnətdəki ölüləri də görür, onların sözlərini qohum-qardaşına söylüyür. Bir belə şəxs, sənin canın üçün, heç dünyaya gəlmiyib. Bir də şeyx baba yatıb yuxuda görür ki, filan dövlətliyə zərər olacaq, o saat ona xəbər verir, o da yaxşıca qurban kəsir, şeyx babaya nəzir göndərir, xülasə, bəlanı rədd eliyir. Bu yuxulardan şeyx çox tez-tez görür, övrətləri yığır bir yerə, günahlarından keçir. Şeyx babanı Qaxay kəndindən qovdular Müskürlü kəndinə, ona bais Kotavan uçteli oldu: yazdı, yazdı... Bax... şeyx də ona qənim oldu, bilirsən nə oldu? Kotavan kəndindən o uçteli Bakı şəhərinə teleqrafnan dəyişdilər.

**Dərdmənd**

## E'LAN

Biz bir neçə Məhəmmədəli ismində olanlar bu yaxınlarda öz adımızı pozub qeyr bir ad qoymaq istəyirik, bu səbəbə ki, hər yerdə otururuq haman saat camaatdan həmin bu Məhəmmədəli adına lə'nətlər eşidirik. İndi yazıb "Molla Nəsrəddin" qarelərinə mə'lum edirik, hərgah mümkün isə "Molla Nəsrəddin" vasitəsilə biz biçarələrə bir neçə adlar yazsınlar ki, adımızı dəyişək.

**İmza: Məhəmmədəlilər**

## POÇTA QUTUSU

.......

Bakıda "Qərib"ə: Elədə xoyluların təkyəsində düşən küftə davasından xəbərin yoxdur. Çap olunmuyacaq.

.......

Bakıda "Sərgərdigan"a: Arabatay.

.......

Lənkəranda "Saleh"ə: Qorxma, səbətimizdə yer çoxdur.

.......

Tiflisdə "Cırcırama" imzası ilə yazana: Hamısı keçib gedər.

.......

Qıraq-Kəsəməndə "Ə.H.M." cənablarına: Şe'rlər qalacaq.

.......

Aşqabadda "Səyyah"a: Yazırsınız ki, Molla Əbdüləli rozəpəz cənabları səfər ayının 12-də cümə günü əlini minbərə vurub and içib ki, Bakıya gələn kimi adamlarını göndərəcək qəzetə yazanların birini öldürsünlər. Əgər doğrudursa, yazın Bakı qoçularına ki, axırda mərsiyəxanlar onların sənətini əllərindən alıb çörəkdən salacaqlar. Əgər yalandan yazırsınız, allah sizə insaf versin.

.......

Vladiqafqazda "Cəfəng"ə: Qorxuram göz dəyə.

.......

Salyanda "Fəqir"ə: Maşallah, yazdıqlarından heç bir tikə də fəqirə oxşamırsan.

.......

Şamaxıda "Abid"ə: Qorxuram kağızını göndərəm mətbəəyə mürəttiblər düzməyələr.

.......

Şamaxıda "M.K." imzası ilə yazana: Poçt Girdman çayından keçəndə kağızınız düşüb, su aparıb.

.......

Gəncədə "Məcnun"a: Doğrudan, elə kağızınızdan da görsənir ki, axırda dəli olacaqsınız. Məsləhət görürəm ki, dəxi qəzetələrə kağız-zad yazmıyasınız və müalicəyə məşğul olasınız.

.......

Gəncədə "Dost"a: Mən ölüm, əl çək, yoxsa Səmərqəndə Hacı Molla Barata yazaram, gəlib yetimlərinizə vəsi' olar.

.......

Gəncədə "Müxbir"ə: Bəlkə bir vaxt işarə edək.

.......

Dərbənddə "C.C." cənablarına: Ümid çox azdır.

.......

Bakıda "Mö'min"ə: Maşallah, maşallah.

## HACI

Ramazan ayında bir nəfər kənd əhli gəlir şəhərə və şəhərdə olan müştərisindən 5-6 yüz

manat pul alır ki, gedib kənddən pambıq, düyü, barama alıb gətirsin müştərisinə. Pul sahibi burada pulunu gözləməkdə olsun, bir neçə kəlmə sənə cənabdan ərz edim: elə pulları müştərisindən alan kimi qayıdıb gəlir evinə və xəlvətcə evində arvad-uşağı ilə vidalaşıb bir araba ya faytona minib gəlib Yevlax stansiyasından maşın biletini alıb gedir Batuma və neçə gündə orada nəmənə hamamına, filana gedir, sonra düz birbaş paraxoda minib gedir Məkkəyə!! Nuxalı qardaşlarımızın bu dindarlığına səmim-qəlbdən təşəkkürlər edirik. Bu savablı işlərin Nuxa və ətrafında çox olmağını genə Feyzullah əfəndinin moizəsinin bərəkətindən zənn edirik.

**Keyfsiz**

## E'LAN

Cənab "Molla Nəsrəddin" məcmuəsinin təvəssütü ilə sair şəhərlərə xəbər verirəm, zeyldə yazılan mallar ucuz qiymətə bizim mağazində satılır. Xahiş edənlərə naloj ilə göndəririk: plov yarmarkası, ağsaqqal vıstavkası, prikaşşik obşestvası, böyüklərin qarışdırması, kiçiklərin barışdırması, konsul dəyişilməsi, uçebnik məsələsi. Xahiş edənlər bu adresə rücu' eləsinlər: Vladiqafqazda Musulmanski küçədə, nömrə telefon 187983.

**İmza: Yolçu.**

Müdir və baş mühərrir:
Cəlil Məmmədquluzadə.

IV ГОДЪ ИЗДАНИЯ № 9 МАРТА 11-ГО 1909г.

# “Молла Насреддинъ”

*КОНТОРА и РЕДАКЦИЯ*
журнала
“Молла Насреддинъ”
Тифлисъ:
*Давидовская ул.., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

*ЦѢНА на ГОДЪ*
*Съ доставкою..............5 руб.*
*За границу....................6 руб.*
*ЦѢНА за ОБЪЯВЛЕНИЯ*
*За место занимаемое строкою*
*петита впереди текста .....10 коп.*
*позади " " " .....7 коп.*

**“Molla Nəsrəddin”in əvvəlinci, ikinci və üçüncü ilinin cildlənmiş kitabları və boş cildləri satılmaqdadır. Cildlərin üstündə Mollanın şəkli və adı, məcmuənin tarixi qızıl vərəq ilə basılıbdır.**

**Qiymətləri idarədə: əvvəlinci ili 5 manat, ikinci və üçüncü ili - 6 manat, boş cildi - 70 qəpik, poçta xərci ilə: əvvəlinci ili - 6 manat, ikinci və üçüncü ili - 7 manat, boş cildi bir manat.**

**İkinci ilin kitabları bu yavuq vaxtlarda hazır olacaq.**




Gimnazistlərimizin məşğuliyyətləri




- Axund, biz yazmaq bilmirik, sən bizim əvəzimizdən

# ملا نصر الدين

№10. Цѣна 12 к. **МОЛЛА НАСРЕДДИНЪ** قیمتی ۱۲ قپیک ۱۰




Литог. Е. Быхова

Ay Allahın axmaq heyvanı, hara soxulursan, dəxi əcəlin yaxınlaşıb.



Min il əvvəl müsəlman üləmasının fənn təcrübəsi (Əbubəkr Razi).




Tələbə: Ay ustad, neçə dəfə yusam bu ət təmiz olar? (zəmanəmizin üləması)

Мясо нужно мыть правой рукой, чтобы оно было чисто…

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д.24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**
**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**28 səfər 1327, bazar** **Həftədə bir dəfə çıxan türk məcmuəsidir** **8 mart 1909**



## *TELEQRAF XƏBƏRLƏRİ*

**Astraxan** - Muxtar Axund cənabları bir neçə yoldaşları ilə "Ərindən uzaq qalan arvadlara asanlıq göstərmək" adında bir kantor açıb əri uzağa getmiş arvadlara az pul ilə nikah oxur və onlara hər cür asanlıq göstərir.

**Kazan** - Məhəmmədrəhim Hacı Yunusovun evində yüz kişidən artıq üləmanın iştirakı ilə elmi konfrans yasaldı. Bu konfransda müsəlmanların nədən ötrü geridə qaldıqlarını uzun-uzun müzakirə etdilər. Bu axır vaxtlarda hökumətin hər yerdə müsəlman məktəblərini bağlamaq istəməyinə qarşı şiddətli protest etdilər və qərar qoydular ki, həm hökumətin bəhanəsini kəsmək, həm də müəllim yetişdirmək üçün dörd-beş böyük şəhərdə müsəlman darülmüəllimini açdırmağa təşəbbüs eləsinlər.

**Tehran** - Əlli min qarğadan ibarət təzə qoşun dəstələri Şahbazül-mülkün komandası altında Təbrizə tərəf göndərildi.

**Peterburq** - Az qalmışdı ki, Duma işləri bir az düzələ, lakin...

**Tara** - İzzətulla molla deyir ki, burası küfrstandır, şəriət hökmlərini burada işlətmək olmaz. Nə növ keyfiniz istəyir, elə edə bilərsiniz.

**İstanbul** - Bura "məşruə"çiləri camaata qol çəkdirirlər ki, biz məşrutə istəmərik, məşruə istərik.

**MOLLA NƏSRƏDDİN**

Biz İstanbul "məşruə"çilərinə məsləhət görürük ki, işlərinin irəli getməsi üçün İrandan bu işdə təcrübədən çıxmış bir-iki müctəhid də'vət etsinlər. Yoxsa cavan türklər bunları da digərləri kimi vurub dağıdarlar.

**Bakı** - Deyirlər, boynuyoğun buradan keçib Avropaya qaçdı, lakin yalandır.

**Şuşa** - Ərbəindən bir gün sonra məscidlərimizin qapıları möhkəm bağlandı. Və'zləri ilə bizə feyz verən mərsiyəxanlarımız da, seyidlərimiz də dəxi yuvalarına çəkildilər.

**MOLLA NƏSRƏDDİN**

Biz bu məzmunda Qafqazın bir çox şəhərlərindən teleqram aldıq. Lakin çap etmək istəmirik, çünki təəccüblü bir xəbər deyil: dən qurtaranda quş da qaçar, tülkü də.







## *NÖVBƏT*

**Ağdamda Hacı İbrahim cənablarına**

Cənab ağa! Gərək elə bilmiyəsiniz ki, biz sizin ətrafdan bixəbərik. İş çoxdur, yazmalı söz həddən artıqdır, amma bunların hamısı növbətnəndir.

Axırı sizə də növbət gəlib çatdı.

Ağdam işlərini əgər başlıyıb yazsam - uzun çəkər və xalqa başağrısı olar. Amma hamısından yaxşısı budur ki, gələsiniz işi barışıq ilə qurtaraq. Əgər bizim təklifimizi qəbul eləsəniz və şərtimizi yerinə yetirsəniz - dəxi bundan sora siz ilə işimiz yoxdur. Əgər qəbul eləməsəniz - o və'də davamız genə öz yerindədir və bunu da biləsiniz ki, yazmaq üçün mətləb çoxdur. Allah bərəkət versin, nə qədər istəyirsən yaz.

Şərtimiz budur.

Bizim bu sözlərimizi oxuyandan bir-iki gün sora Ağdam camaatına və ətraf kəndlərin əhalisinə xəbər verin ki, filan günü yığışsınlar Ağdam məscidinə və ya qeyr bir yerə. Və bundan ötrü dəxi istixarə lazım deyil: hər gün və hər saat bir belə işdən ötrü xoşdur. Amma çağıranda bəyləri də çağırın. Gələrlər gəlsinlər, gəlməzlər gəlməsinlər.

Elə ki camaat yığışdı, çıxın bir uca yerə, bir ustul üstünə və üzünüzü camaata tutub deyin:

Qardaşlar! Ağdam qəsəbəsi və ətrafda olan yavuq kəndlər dörd min evə qədər camaatdır. Bu dörd min evin uşaqları baxır ancaq Ağdamın iki şö'bəli hökumət məktəbinə. Hər il sentyabr ayında bir-iki günün içində məktəbə bir müəyyən qədərincə uşaq götürüləndən sora məktəb naziri xəbər verir ki, yer yoxdur. Dörd min evin dörd min uşağı düşür küçələrin canına və qəmiş minib qoşunkeşlik eliyirlər.

Əgər Ağdamın lap yavuqluğunda olan on altı kəndin hər biri ildə yüz manat versə, bircə bu elər ildə min altı yüz manat, yə'ni hər evə bir manatdan da az düşür. Həmin min altı yüz manat pula bir yaxşı məktəb açıb saxlamaq olar.

Xülasə, sözü uzatmaq lağlağıların peşəsidir. Mənim bu işarəmdən hər bir arif gərək başa düşə ki, nə demək istəyirəm.

Budur bizim şərtimiz, cənab axund! Yoxsa elə bilmiyin ki, biz dünyanın dib-bucağından xəbər verə-verə Qafqazda bu qədər şöhrət tapan Ağdam vilayətindən bixəbərik. Bilirik, bilirik və əgər indiyədək yazmırdıq - o cəhətdən ki, hər bir iş növbət iledir.

Əgər ərzimə e'tina eləməsəniz - ixtiyar sizindir, amma "növbət" məsələsini yadınızdan çıxarmıyın.

**Lağlağı**

## *MOZALAN BƏYİN SƏYAHƏTNAMƏSİ*

Oxucular heç təəccüb eləməsinlər ki, bu vaxtadək məndən bir xəbər yoxdur. Xorasandan qayıdandan sora gəlmişdim İrəvana və idarəyə bir məktub göndərib istədim qalam İrəvanda və burada olan işlərdən gahdan bir yazam. Amma bir az qaldım, gördüm ki, burada yazmalı bir mətləb yoxdur. Əhalisi hamısı öz işində, hamı sakit, rahat və faraqat. Hər bir kəs səhər yerindən durub başını salır aşağa, gedir dükanına və axşam genə başını aşağa salıb gəlir evinə, küçə qapısını cəftələyib girir yerinə.

Bir ay olardı ki, İrəvanı boşluyub Naxçıvana tərəf başladım səyahət eləməyə. Yolda bir gün yenib qaldım Baş Noraşendə və burada hər bir şeydən qabaq bunu bildim ki, Şərurun düyüsü bu il bahalanıb. Mə'lum şeydir ki, Şərurda çox düyü əmələ gələr. Bahalanmağının səbəbini bir dükançıdan soruşdum və dükançı mənə qəribə bir cavab verdi ki, guya düyü ondan ötrü bahalanıb ki, Ordubadda qlava seçəcəklər. Artıq təəccüb elədim ki, qlava seçilməyin düyünün bahalanmağına nə dəxli var. Burada bu barədə bir elə cavab ala bilmədim, çünki hərə bir söz deyirdi.

Baş Noraşendən gəldim Naxçıvana. Burada bir neçə mö'təbər adam vəfat eləmişdi və camaatı böyük bir qüssəyə salmışdı. Həqiqət, mən elə başa düşdüm ki, bu vücudların yox olması Naxçıvan camaatı üçün əlahiddə bir bədbəxtlikdir. Biçarə əhalinin gözünün yaşı qurumurdu. Vəfat edənlərin çoxu müsinn adamlar idi və özləri də çox dövlət sahibləri idi. Hər biri öləndə məktəblərə və yetim uşaqlara çoxluca pul və mülk vəqf eliyiblər. Lakin bu da əhali üçün təskinül-qəlb ola bilməzdi. Doğrudur, mərhumlar öz fövtlərini səmərəsiz və nişanəsiz qoymadılar, amma camaata onların sağlığı dəxi də lazım idi, dəxi də vacib idi, çox-çox vacib idi.

Xülasə, pərvərdigari-aləm ölənlərin ruhunu şad və qalanların "Pirqəmiş" məhəlləsini abad eləsin.

Bir neçə gün qalandan sora gəlib çıxdım Culfaya. Burada da qəribə əhvalat öyrəndim: Arazdan bu tərəfə çox mərsiyəxan keçirdi. Mən elə xəyal elədim ki, bunlar Naxçıvana və İrəvana gedəcəklər. Amma mə'lum oldu ki, hamısı Ordubada gedir. Səbəbini soruşdum və dedilər ki, Ordubadda qlava seçəcəklər.

Dəxi gördüm işlər özgədir. Xəyal elədim bu Ordubad, əlbəttə, gərək bir böyük, bir əhəmiyyətli vilayət ola. Bir tərəfdən Şərurun düyüsü bahalanıb, bir tərəfdən İranın cəmi vaizləri üz qoyublar Ordubada; nədən ötrü? Ondan ötrü ki, Ordubadda qlava seçilir.

Bəs lazımdır Ordubadı ziyarət eləmək. Gəldim Ordubada və burada iki gün qaldım. Gördüklərimi və eşitdiklərimi gələn nömrədə yazaram.

Amma Naxçıvan və Tiflis şpionlarından təvəqqə eliyirəm ki, müştəbeh olmasınlar. Mən indi Ordubadda deyiləm. Nə oradayam, nə Culfadayam, nə Naxçıvanda və İrəvanda; "nə yerdəyəm, nə göydə" və heç zəhmət çəkməsinlər, tapa bilməzlər.

Çünki qorxumdan gizlənirəm. Hərçənd heç günahım yoxdur və heç təqsirin sahibi deyiləm, amma genə gizlənməyi məsləhət görürəm.

(Mabə'di var)

**Məşədi Mozalan bəy**

## ALLAHA ŞÜKÜR OLSUN

Allaha şükür olsun ki, axırı Bakıda da əmin-amanlıq bərqərar oldu. Doğrudan, mən həmişə Bakının işlərini eşidəndə xarab olardım: həqiqət, bu qədər bədbəxtlik, bu qədər zülm və fəsad ki, Bakıda üz verirdi, heç bir yanda olmuyan və eşidilmiyən bir iş idi. Gün olmazdı ki, küçə və bacada adam ölməsin, adam yaralanmasın, adam oğurlanmasın. Heç kəs cür'ət edib küçəyə çıxa bilmirdi. Millətlər içində biabır olmuşduq. Xülasə, indi allaha min şükürlər olsun ki, bunların hamısı bir günün içində götürüldü. Xudayi-təala dərgahından istədiyim budur ki, şəhər rəislərimizin və idarə üzvlərinin və cəmi şəhər rişsəfidlərinin bir neçəsinin ömrünü tulani eləsin.

Vaqeən, insan fikirləşdikcə şad olur, düşündükcə qəmgin olur; qüssə etdikcə sevinir və sevindikcə az qalır ki, insan dəli-divanə olsun və bunların hamısı keçəndən sora adamın ruhu şad olur.

Allah baislərin ruhunu şad eləsin! Genə şükür olsun allaha ki, işlərin axırı xeyir oldu. İndi Bakıda o qədər sakitlikdir, o qədər rahatlıqdır, o qədər arxayınlıqdır ki, əhali qurd-quzu kimi otluyurlar, necə ki Məşədi Sijimqulu deyib:

Sirqətə, qətlə, qəbih işlərə
eyləndi əlac,
Qəmə, qəddarə, karastular
olundu ixrac,
Bakıda əmn-amanlıq yenidən
tapdı rəvac,
Bədnəzərdən bizi hifz eylə,
xudaya, mən ölüm.
Malades bakılılar gör necə
bidad elədi,
Afərin onlara, şəhri əcəb
abad elədi,
Qorxudan qəmli olan
qəlbləri şad elədi,
Bədnəzərdən bizi hifz
eylə, xudaya, mən ölüm.

**Dəli**

## KƏRAMƏT

Nuxa Cümə məscidinin əfəndisi Hacı Mahmud əfəndi mərhum olandan sonra müsəlmanlar əfəndisiz qalırlar. Heç kəs tapılmır, çünki əfəndilər xırmanda, bağlarda, kəndlərdə zəkata məşğuldurlar. Qışlaq əfəndisi bir qabil, elmli, yerin altında və göyün üstündə nə var isə bilir, kimin çardağında nə qədər buğda və arpa var isə onu da bilir. Bu əfəndi ramazan ayının on beşində gəlir həmin məscidə minbərə çıxır; gecə-gündüz əfəndi duaya, namaza məşğul olur. Bu cür dolanır orucluq qurtarana kimi. Orucluq qurtarır, camaatdan pulcığazını yığır. Camaat elə bilir ki, həmişə bu əfəndi qalacaq, amma əfəndi birdən yox olur. Bir də görürlər Qışlaqda kəramət sahibi olub.

**Dərdmənd**

## ADSIZ KAĞIZ

Müəllimi-şəriəti-mədrəsə dü sal qəbl bərin məktəbdar bud, hala həm mixahəd məktəbdari künəd. Miguyəd mədrəseyi-cədid bəhökmi-müctəhidi-Təbrizi həraməst və saniyən miguyəd mən dər Təbriz xidməti-müctəhid ağa məhkəmə şagird budəm, tarix və hesab və coğrafi və fizik və şimi, farsi, ərəbi, rusi, fransə, məşq və diktə, müdiri, nazimi, müəllimi, fərraşi, həmə çizra midanəm, möhtac bədigəri nist. Miguyəd in müəllimin və müdir həmə firəngi. Babi və laməzhəbənd, mixahənd ətfalra laməzhəb künənd.

Müdiri-mədrəsə adəmi-bihal və bihiss və bihərəkət əst, yə'ni şahzadə əst, miguyənd tiryak həm iste'mal mikünənd, əz-müəllimi-şəriət xeyli mitərsəd, dər vaqeyi-in şahzadə nokəri-müəllimi şəriət əst. Biçarə həqq darəd, çünki müəllimi-şəriət zitöhmət zədən büsyar mahir əst, çinan ki, şahzadə Eynüddövlə əztəbriziha və müş əz gürbə mitərsəd, in şahzadə niz əz-müəllimi-şəriət in qədr mitərsəd.

Dəxi bundan sora bu cür adsız kağızları çap etmiyəcəyik.

## TİCARƏT XƏBƏRLƏRİ

Keçən nömrələrin birində bir belə şəkil çəkmişik ki, hacılarımız Məkkəyə gedib qayıdandan sora kasıblıyıb yolux cücəyə oxşuyurlar.

Dünyada hamı səhv eliyə bilər. Çox ehtimal var ki, biz bu barədə həqiqətdən çox kənarıq. Məsələn, Gəncədən yazırlar ki, Gəncə hacılarının əhvalatı bizim şəklə müvafiq gəlmir. Məsələn, Gəncədə elə hacılar var ki, Məkkəyə getməseydilər, bu qədər dövlətə çata bilməzdilər və bu qədər hiylə yollarını öyrənə bilməzdilər və bu qədər hörmət qazana bilməzdilər. Yazırlar ki, Gəncə hacıları əgər Məkkəyə getməseydilər, qohum-qardaşlarının on min manatlıq mülkünə sahib ola bilməzdilər və natariusda şərtnamə qayıranda bijlik eliyib mülk sahibinin adını şərtnamədən çıxarda bilməzdilər.

Haman şəkli çəkəndən sora Gəncədən dörd məktub almışıq. Yazırlar ki, "ay Molla Nəsrəddin,

məgər Məkkədən qayıdan hacı kasıb olar? Elədə bəs sən bizim Gəncədə filan bəyi tanımırsan, filan şeyxi tanımırsan, filan məşədini tanımırsan, filan hacını tanımırsan".

Genə deyirik, bizim bu barədə bəxtimiz yoxdur, amma təəccüb buradadır ki, hələ özgə şəhərlərdən bu xüsusda bizə rədd yazan yoxdur. Lakin söz veririk ki, əgər özgə şəhərlər də Gəncə kimi olsa, onda biz sözümüzü geri götürərik və cəmi dövlətli hacılardan təvəqqə edərik ki, bizi bağışlasınlar.

Hər kəsin sözü var, yazsın.

**Molla əmi**

## MƏTBUAT

**"Russkoye znamya" yazır:**

Müsəlman dövlətliləri tərəfindən müsəlman tacirlərinin ehtiyaclarını dəf' niyyətilə açılacaq "Şərq" bangının planı hazırlanıb qurtardı. Mərkəzi Peterburqda, şö'bələri : Tiflis, Tehran, Buxara, Xivə və Kaşğarda olacaq.

**Molla Nəsrəddin**

Heç keyfini pozma! Müsəlmanlar səndən də bijdirlər. Belə böhtanlar ilə onların boynuna bang-zad qoya bilməzsən!

.......

**"Vəqt":**

Rusiyadakı dostlarımdan aldığım kağızlarda mənə məzəmmət edib belə yazırlar:

"Birjovıye vedomosti" qəzeti kimi sən də niyə türkləri mədh eləmirsən? Sən tatar ola-ola neçün Osmanlı türklərinin qüsurunu "Vəqt"ə yazırsan?

"Vəqt"in İstanbul müxbiri "Ay"

**Molla Nəsrəddin**

Hə, çox yaxşı yazırlar. İnsan da öz millətinin qüsurunu heç aləmə aşkar edərmi? Nədən ötrü yazmırsan ki, Osmanlı parlamentinin üzvləri arasında heç fikir və məslək ayrılıqları yoxdur, biri nə buyursa, hamısı : "Bəli, bəli, qurbanın ollam" - deyirlər.

.......

**"Tərəqqi"** müsəlman maarifi məqaləsində yazır: 20-30 müsəlmanı ruslaşdırmaq asan şeymi? Bu sümüyü mümkündürmü udmaq?

**Molla Nəsrəddin**

Hay, Hay! Çox asandır. İndiki fənn, indiki Duma ilə məgər çətindir sümükləri toz edib udmaq?

.......

**"Bəyanül-həqq":**

İngilis professorlarından "Laüveil" isbat edir ki, Mars ulduzunda canlı şeylər də var, insan da var; hətta oranın insanları millət və firqə ayrılıqları bilməzlər, hamısı birdir.

**Molla Nəsrəddin**

Görünür orada hələ keşiş və mərsiyəxan törəməmişdir.

.......

**"Sabah" yazır:**

Osmanlı parlamentində Bakı xanımlarının təbrik teleqramı oxundu. Bundan sora İsmayılbəy adında bir məb'us dedi:"Mən Bakıda Tağıyevin qız məktəbini gördüm, Avropada belə onun misli azdır".

**Molla Nəsrəddin**

İsmayılbəyin kamalına bərəkallah! Doğrusu, hünər bizim Tiflisin şeytanbazarı məşədilərini aldatmaq deyil, Osmanlının o elmli parlamentini çocuq yerinə qoymaqdır.

## *Poçta qutusu*

.......

Şamaxıda "Yazığ"a: Şamaxıda, maşallah, hamı şairdir.

.......

Axtıda Əbdülmətləb Hacıyev cənablarına: 7-ci nömrədə poçta qutusunda yazdığımız Əbdülmətləb siz deyilsiz.

.......

Naxçıvanda "Bayquş"a: Çətin məsələdir. Naxçıvan mərsiyəxanından savayı onu heç kəs bilə bilməz.

.......

Mərvdə "Həsrət"ə: Nahaq yerə elə xəyal eliyirsən ki, Molla Əbdüləli Lahıca gedə bilmir.

.......

Vladiqafqazda "Ş.Ə." cənablarına: Mə'lum edin görək kağızı hansı tərəfdən başlıyıb oxuyaq?

.......

Tiflisdə "Q.Ə." imzası ilə yazana: Dərbənddə bir pir var. Adına "Davud piri" deyirlər. Arvadlar pirin üstünə gedib qışqırırlar: "Ey Davud, məni ərimdən sovut - Ey Davud, məni ərimdən yovut".

Mənim də yolum o pirə düşsə, belə deyəcəyəm:

"Ey Davud, məni soğan kərdilərindən sovut".

Məni xoş xət sahiblərinə ovut".

.......

Ağdaşda "X." cənablarına: Özümüzə dair jurnalda bir şey yazmırıq.

Müdir və baş mühərrir
Cəlil Məmmədquluzadə.

## TƏVƏQQƏ

Fevral ayının 26-cı günü mən Tiflisdən Aleksandropola gedəndə gecə Sadaxlı və Axtala istansiyasının arasında mənim səbətimdən portfelim yox olub, içində çox lazımlı kağızlarım və sənədlərim.

Həmin kağızlar mənim üçün o qədər lazımlıdılar ki, əgər mənim əlimə gəlməsələr, mən divan qabağında cavab verməliyəm və tənbeh altına düşəcəyəm.

Bu e'lan ilə təvəqqə edirəm ki, hər kəs bu kağızlardan xəbəri var, yainki bir yanda tapıbsa allah rizası üçün gətirsin, Tiflisdə "Severnı nomera" mehmanxanasında 82 nömrədə versin mənə. Mən sədaqətən əhd edirəm ki, həmən adama layiqincə zəhmət haqqı verəm.

## İDARƏMIZDƏ SATILAN KITABLAR

| Kitabların adları | Yazanlar | Qiymətləri: idarədə | Qiymətləri: poçta xərcilə |
|---|---|---|---|
| Dərs kitabları: Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dəsr kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Uşaq bağçası, birinci il üçün dəsr kitabı | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Bəsirətül-ətfal, ikinci il üçün dəsr kitabı | -*--*--*- | 25 qəp. | 30 qəp. |
| Məşq məcmuəsi | Mirzə Abbas Mollazadə | 8 qəp. | 10 qəp. |
| Qiraət kitabları: Təşrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*--*--*- | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir (farsca) | Mirzə Mülkümxan | 20 qəp. | 24 qəp. |
| Məbdəш-tərəqqi (farsca) | -*--*--*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıbzadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*--*--*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*--*--*- | 25 qəp. | 25 qəp. |
| Müəllimüş-şəriə (birinci hissə) | -*--*--*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüş-şəriə (ikinci hissə) | -*--*--*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıbzadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*--*--*- | 5 qəp. | 5 qəp. |
| Asari Əhmədbey Cavanşir (milli şe'r məcmuəsi) | -*--*--*- | 25 qəp. | 30 qəp. |

***Şagird dəftərləri: idarədə yüz dənəsi 2 manat 40 qəpik. Nalojnı vasitəsilə istəyənlər hər sifarişə 17 qəpik artıq poçta xərci verəcəklər.***

IV ГОДЪ ИЗДАНIЯ № 10 МАРТА 8-ГО 1909г.

# "Молла Насреддинъ"

*КОНТОРА и РЕДАКЦIЯ*
журнала
"Молла Насреддинъ"
Тифлисъ,
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКIЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

***ЦѢНА на ГОДЪ***
*Съ доставкою..............5 руб.*
*За границу....................6 руб.*
***ЦѢНА за ОБЪЯВЛЕНIЯ***
*За место занимаемое строкою петита впереди текста ......10 коп.*
*позади " " " ......7 коп.*

"Molla Nəsrəddin"in əvvəlinci, ikinci və üçüncü ilinin cildlənmiş kitabları və boş cildləri satılmaqdadır. Cildlərin üstündə Mollanın şəkli və adı, məcmuənin tarixi qızıl vərəq ilə basılıbdır.

Qiymətləri idarədə: əvvəlinci ili 5 manat, ikinci və üçüncü ili - 6 manat, boş cildi - 70 qəpik, poçta xərci ilə: əvvəlinci ili - 6 manat, ikinci və üçüncü ili - 7 manat, boş cildi bir manat.

İkinci ilin kitabları bu yavuq vaxtlarda hazır olacaq.



Педагоги по ночам

Bə"zi uçitellərimizin gecə zəhmətləri



Adə, girin içəri, uçitel gəlir...

Днём




Axund: A qız, səsin ki çıxmır, görünür razısan.
Allahın əmri ilə səni bu oğlana nikah elədim.
Благославляю, ибо видно вы обо сопласны.




Öz xoşuna gəlməzsən, zornan aparram.
Нe захочешь идти - потощу насильно.